## *ÖN SÖZ*

Həmd olsun aləmlərin Rəbbinə! Uca Allahdan kömək diləyirəm və bütün işimi Ona həvalə edirəm. Seyyidimiz Muhammədə, onun ailəsinə və bütün əshabına salət və salam olsun.

Bəşəriyyəti ən gözəl, kamil şəkildə yaradan Allah Azzə və Cəllə qadın və kişini eyni nəfsdən xəlq etdiyini bizlərə bildirmişdir. Lakin Rəbbimiz qadını ən gözəl, incə və zərif hisslərlə - mərhəmət, şəfqət və analıq hissləri ilə zinətləndirmişdir.

Allah Subhanə və Təala din olaraq İslamı tamamladı və bizi müsəlman olmaqla şərəfləndirdi. Ona (c.c) sonsuz şükürlər olsun!

Qız uşaqlarının diri-diri torpağa basdırıldığı cahiliyyə dövründə İslamın gəlişi ilə qadının qadın, həyat yoldaşı və ana olmaq dəyəri ucaldı, dinimiz onu şərəfləndirdi və Cənnəti ayaqları altına sərdi. Eləcə də, Allah Rəsulu ﷺ qadının bir əmanət olduğunu vurğulayaraq buyurur: **"Qadınlara qarşı ancaq xeyir tövsiyə edin. Çünki onlar sizin yanınızda bir əmanətdir"**.[1] "**Kişi evləndiyi vaxt dininin yarısını qoruduğunu, qalan yarısı üçün də Allaha qarşı gəlməkdən çəkindiyini"** - buyurur Sevgili Peyğəmbərimiz ﷺ.[2]

Bundan əlavə, İslam qadını ictimai, ailə və analıq məsuliyyətinə tabe tutur, ərinin haqqını ödəmək, ona qarşı vəzifələrini tam yetirmək, cəmiyyətə əxlaqlı, imanlı və saleh övlad yetişdirmək kimi vəzifələri qarşısına məqsəd qoyur.

Bu kitab, İslamda qadınlarla bağlı müxtəlif şəriət əhkamlarını cəm edən bir çalışmadır. Kitabı müxtəsər şəkildə və hər kəsin başa düşəcəyi bir dildə, Hənəfi məzhəbinin fətva verilən görüşlərini qeyd etməklə, siz oxuculara təqdim etməyə çalışdıq. Eyni zamanda, Şafii məzhəbinin fərqli görüşlərini səhifələrin aşağı qeydlərində tapa bilərsiz. Hənəfi məzhəbiylə eyni olan görüşlərini isə, təkrar kitabın mətnində ayrıca qeyd etməyə ehtiyac görmədik.

Kitabda qadınların indiki əsrə qədər ümumi halları, onun ictimai həyatda tutduğu yeri, əxlaqi keyfiyyətləri, qızların təlim-tərbiyəsi, qadınlara məxsus hallar və s. mövzular öz əksini tapmışdır. Eyni zamanda, qadınları ən çox maraqlandıran müasir mövzulara aid fətvaları da qeyd etməyi zəruri bildik.

Allah-Təaladan bu kitabın müsəlman qadınlar və qızlar arasında layiqli yer tutacağını, elmlərini inkişaf etdirib öyrənmələri üçün xeyirli bir vəsilə olacağına ümid edirəm. Eyni zamanda, onları qayğılandıran və məşğul edən çətinliklərin həllinə faydalı olacağını diləyirəm. Əgər xətam varsa, məni üzrlü saymağınızı və haqqınızı halal etməyinizi ümid edirəm. Müvəffəqiyyət Allahdandır.

***Afət Müseyibqızı***

---

[1] İbn Macə, "Sünən", 1851.
[2] Heysəmi, "Məcmə'-uz-Zəvaid", 7310; Acluni, "Kəşf-ul-xafa", 2/239.

# *I - İslamda qadın*

Uca Allah eyni nəfsdən yaratdığı kişi və qadını bir-biri ilə ünsiyyət edəcək bir fitrətə sahib etdi. Allah-Təala insanlığın ilk atası və ilk Peyğəmbəri olan Adəmi (ə) təkbaşına deyil, öz cütü Həvva anamızla birlikdə yaradıb dünya həyatını bərabər bölüşəcəklərini murad etmiş və bunu insanlığa bildirmişdir. İslamda qadına daim önəm verilmiş və onların hüquqları qorunmuşdur. Peyğəmbər ﷺ bir hədisində buyurur: **"Ey insanlar! Qadınların hüquqlarına riayət edin! Onlara şəfqət və sevgi ilə davranın! Onlar haqqında Allahdan qorxmağınızı tövsiyə edirəm. Siz qadınları Allah əmanəti olaraq aldınız; onların namuslarını və iffətlərini Allah adına söz verərək halal edildiniz!"**[3], digər bir hədisdə buyurur: **"Sizin xeyirliniz, qadınlarına qarşı xeyirli olanıdır (gözəl davranandır)"** [4], bununla yanaşı, qadınlara pislik edən kişilər də qınanmışdır: **"Qadınlara ancaq kərim olanlar ikram edərlər** (dəyərli olanlar dəyər verərlər)**; onlara pislik edənlər isə pis insanlardır**[5]**".**

Qadın həm də anadır və İslam, bəşər övladını böyüdüb, ona tərbiyə verən anaya yüksək dəyər vermişdir. Belə ki, bir hədisdə Allah Rəsulu ﷺ buyurur: "**Cənnət anaların ayaqları altındadır."**[6]

İslama görə, qadın və kişi bir-birini tamamlayan varlıqlardır. Dini məsuliyyət, hüquqi əhliyyət, əsas haqq və azadlıqlar baxımından qadınla kişi arasında fərq qoyulmur. Qadına heç bir dəyərin verilmədiyi, qız uşağı valideyni olmağın üz qarası kimi qəbul edildiyi və bu səbəbdən qız uşaqlarının diri-diri torpağa basdırıldığı bir dövrdə İslam, dəvətin başladığı ilk illərdə belə, qadını həmsöhbət kimi qəbul etmiş və heç bir fərq qoymadan ona müraciət etmişdir. Qurani Kərimdəki **"Siz** (hamınız) **bir-birinizdənsiniz"**[7]**, "Mömin kişilər və mömin qadınlar bir-birlərinin dostlarıdırlar"**[8] və **"Qadınlar sizin üçün siz də onlar üçün örtüksünüz"**[9] ayələri qadınla kişinin bir-birinə bərabər və bir-birini tamamlayan iki ünsür olduğunu vurğulayır. Eləcə də Peyğəmbərin ﷺ Hüdeybiyyə sülh razılaşmasında Ümmü Sələmə anamızın məsləhətinə əməl etməsi onun qadınların fikrinə nə qədər önəm verdiyini göstərir.

Qadın cəmiyyətin xoşbəxtliyi, əmin-amanlığı və nəsillərin davamı üçün Uca Allah tərəfindən verilmiş bir imkan olaraq görülməlidir. Yaxşı təhsil alan qadınların övladlarına gözəl dəyərləri mənimsədib mənəvi hislərlə böyüdərək, güvən, rahatlıq, qardaşlıq hislərinin meydana gəlməsinə və ölkənin inkişafına

---

[3] Müslim, "Səhih", "Həcc", 147.
[4] Müslim, "Səhih", "Yaxşılıq",149.
[5] İbn Macə, "Ədəb", 3; Əbu Davud, "əs-Sünən"; "Ədəb", 6 ;"Riqaq"; 22; Müslim, "Səhih", "Əqdiyə",11.
[6] Nəsai, "Cihad", 6.
[7] Ali İmran 3/195.
[8] Tövbə 9/71.
[9] Bəqərə 2/187.

önəmli dərəcədə fayda verəcək reallığı görməzlikdən gəlmək olmaz. Qadın insan olma baxımından kişi kimidir. Bu mövzuda Haqq Təala insanları tək bir nəfsdən yaratdığını [10], qadın və kişi iman edib ibadət edərlərsə, cənnətə girəcəklərini, küfr edib üsyan edərlərsə, cəzalandırılacaqlarını[11], kişi və qadın - heç bir çalışanın zəhmətini zay etməyəcəyini[12] bildirir. Başqa ayələrdə də, müsəlman kişi və qadınlarla mömin kişi və qadınlardan, itaət edən, doğruluq sahibi, səbir edən, Allaha qəlbən hörmət göstərən, sədəqə verən, namuslarını qoruyan, Allahı çox zikr edənlərə böyük bir mükafat hazırladığını açıqlayır[13]. Qurani-Kərim kişilərin qadınlar üzərində haqlarının olduğu kimi, qadınların da kişilər üzərində haqları olduğunu[14] bildirərkən, qadına miras haqqı tanıyır. İslam kişilərin və qadınların qazandıqlarından özlərinə bir pay olduğunu [15] vurğulayaraq qadına mülkiyyət hüququ tanıyır. İslam qadını cəhalətdən xilas etmiş, mövqeyini yüksəldərək şərəfli etmişdir. Təhsil almış müsəlman qadınların təhsilə böyük ölçüdə fayda verdikləri barədə İslam tarixində bir çox nümunələr mövcuddur. Xülasə, İslam dini insanın ana və atasına yaxşılıq etməsini tövsiyə etmiş, xüsusilə, anasının onu zəhmətlə daşıdığı və dünyaya gətirdiyinə Qurani-Kərimdə diqqət yetirərək qadınlara hər vəziyyətdə hörmət göstərilməsini ifadə etmişdir[16].

---

[10] Nisa 4/24.
[11] Nəhl 16/97.
[12] Ali İmran 3/195.
[13] Əhzab 33/35.
[14] Bəqərə 2/228.
[15] Nisa 4/32.
[16] Əhqaf 46/44.

## *II - Islam tarixində iz qoyan qadınlar*

Qadın mədəniyyətin təməlini qoyan, sənətləri və elmin həqiqətlərini kəşf edən, milli və mənəvi dəyərləri nizamlayan, vətənə və ümmətə layiqli, saleh övladlar tərbiyə edən bir şəxsiyyətdir. İslamın ilk əsrlərində qadınlar ictimai və elmi həyatda fəal yer tutmuşlar. Müharibələrdə şəfqət bacısı vəzifələrində olmaqla yanaşı hədis, fiqh və digər dini elmlərdə də olduqca fəal olmuşlar. Riyaziyyat, tibb və astronomiya kimi sahələrlə də məşğul olmuşlar, lakin bunların əksəriyyəti tarixdə qeyd olunmamışdır. İslam tarixində iz qoyan qadınlar barədə qısa məlumat verməyi özümüzə borc bilirik:

### *1) Möminlərin anası Xədicə (r.a)*

Müsəlman xanımlar arasında, ictimai həyatda da etibar sahibi olan şəxs Xədicə (r.a) anamızdır. Böyük İslam qadını, möminlərin anası, Allah Rəsulunun ﷺ dəyərli zövcəsi Xədicə (r.a) hicrətdən 68 il əvvəl, əsilli bir ailədə dünyaya göz açmışdır. Atası Xuveylid, Qureyşin böyüklərindən və sərvət sahibi idi. Anası Fatimə isə Məkkənin tanınmış və iffətli qadınlarından sayılırdı. Cahiliyyə dövründə yaşadıqlarına baxmayaraq, belə hörmətli bir ailədə böyüyən Xədicə (r.a), elə bir şərəf, heysiyyət və iffət dolu bir həyat yaşayırdı ki, camaat içərisində "Tahira" (təmiz, pak və iffətli qadın) deyə məşhur olmuşdur. Halbuki nəfsani həvəslərini və arzularını həyata keçirmək üçün hər cür maddi imkana sahib idi.

O, hətta müsəlman olmadan əvvəl də, insanın dəyər və üstünlüyünü dünya malına, pula, irqə, məqama deyil, onda olan gözəl sifətlərə, insani və əxlaqi dəyərlərə bağlayırdı. O dövrün Məkkəsinin ən varlı, ən tanınmış şəxsiyyətlərinin (Əbu Süfyan, Əbu Cəhl, Əqabə bin Əbi Müayd kimi) evlənmə təkliflərini rədd etmiş və gözü daha çox fəzilət, insanlıq, dürüstlük, sədaqət və başqa sifətlərlə bəzənən bir kəsi axtarmış və Allah Rəsulunu ﷺ tanıyana qədər başqasına ərə getməyə razılıq verməmişdir. Ancaq Peyğəmbərlə ﷺ tanış olduqdan sonra onun fəqir və yetim olmasına baxmamış, şəxsən özü evlənmə təklif etmişdir.

### *2) Ümmül-Möminin Aişə (r.a)*

Peyğəmbər ﷺ vəfat etdiyi vaxt çox gənc olmasına baxmayaraq, Aişə (r.a) Qurani-Kərimi və Peyğəmbərin ﷺ sünnəsini ən yaxşı bilən, anlayan və muhafizə edən səhabələrin başında yer tutur. Ərəb dilini məharətlə istifadə etməsi ilə yanaşı, ərəb şeirini də çox yaxşı bilirdi. Aişə (r.a) anamız fəsahət və bəlağəti ilə də məşhur bir xətib olduğu üçün nitqi insanlara çox təsir edərdi. Atası vəfat edən zaman qəbri başında etdiyi dua, Cəməl hadisəsindəki xütbəsi və bəzi məktubları onun ədəbi qabiliyyətini göstərən şah əsər nümunələridir. Eləcə də ərəb

tarixi, ənsab elmi [17], cahiliyyə dövrünün ictimai vəziyyəti, adət-ənənələri haqqında geniş biliyə malik idi. Şeir və ədəbiyyat ilə tarix və ənsabı, bu mövzularda ixtisaslaşmış olan atası Əbu Bəkrdən (r.a) öyrənmişdir. Həmçinin Qurani-Kərimi təfsir etmişdir. Peyğəmbər sünnəsini nəql və şərh etməklə qalmamış, eyni zamanda, onun düzgün anlaşılması üçün elmi-tənqidi fikirlərini ortaya qoymuşdur. Kiçik yaşından bəri Quranı əzbərləməyə başlamış, ayələrin qiraət tərzini yaxşıca öyrənmişdir. Xüsusilə, Mədinədə nazil olan ayələrin nüzul səbəblərini, dəlalətlərini, təhlilini və hər ayə ilə necə istidlal edib əhkam çıxarılacağını çox yaxşı bilirdi. Həmçinin Aişə (r.a) hədislərdən istinbat və qiyas üsulu ilə yeni hökmlər çıxarmışdır. Onun ictihad və fətvaları, özünün bir fəqih və müctəhid olaraq qəbul edilməsini təmin etmişdir. Peyğəmbərin ﷺ əshabı arasında, çox saylı fətva verməsi ilə məşhur olan yeddi şəxsdən biri də Aişə (r.a) anamızdır. Bir çox fiqhi məsələ ilə yanaşı usuli-fiqh, hikməti-təşri[18] və xüsusilə fəraiz (varislik hüququ) sahələrində dərin bir anlayışa sahib idi. Tələbələrindən Kufə fəqihi Məsruqun söylədiyinə görə, əshabın böyükləri fəraizə aid məsələləri ondan soruşardılar. Hədis və fiqh mənbələrində onun bəzi səhabələrdən fərqli fətvaları geniş yer tutmuşdur. Tabein dövrünün bir çox islam hüquqşünası, yüksək səviyyədəki hüquqi biliyindən faydalanmaqla, onunla elmi məşvərət etmişlər. İslam hüququ sahəsindəki rəyləri qardaşı oğulları Qasım, Ürvə və başqa tələbələri tərəfindən nəql edilmişdir.

### ***3) Ümmü Dərda (r.a)***

Müaviyənin oğlu İyas tərəfindən dövrün böyük adlarından belə üstün tutularaq hədislər məsələsində hakim təyin edilən Ümmü-Dərda Peyğəmbərimizdən ﷺ bir xeyli hədis əzbərləyərək rəvayət edən ağıllı, bilikli bir xanım səhabə idi.

Ümmüd-Dərda (r.a) ağıllı, bilikli, yaddaşı qüvvətli bir xanımdır. Aləmlərə rəhmət olan Peyğəmbərimizdən ﷺ eşitdiyi və ya nəql etdiyi bir çox hədisin yayılmasına vəsilə olmuşdur. Eşitdiyi hədisləri özü şəxsən ətrafındakılara danışaraq rəvayət etmişdir. Onlardan bir neçəsi "Kutubus-sittə"də yer almışdır.

Həmçinin, hədis elminə öz töhfələrini verən digər səhabə qadınların adlarını qeyd etmək də istərdik. Bunlardan Əmrə bint Əbdürrəhman bin. Səd bin. Zürarə (v. 98/716), Hafsa bint Sirin əl-Ənsariyyə (v. 101/719), Nəfisə bint əl-Həsən b. Zeyd b. Həsən b. Əli b. Əbu Talib (v. 208/824), Kərimə bint Əhməd b. Muhammməd b. Xatim əl-Mərvəziyyə (v. 463/1070), Şühdə bint Əhməd əd-Dinəvəriyyə (v. 574/1178), Əfîfə bint Əhməd b. Əbdülqadir əl-Fərifəniyyə (v.

---

[17] Ənsab "soy, nəsil" mənasına gələn "nəsəb" sözünün cəmidir. Bir fikrə görə yalnız ata tərəfindən, digər bir fikrə görə nəsəb həm ata, həm ana tərəfindən olan qohumluq əlaqəsinə deyilir. "İlm-ul ənsəb", yəni ənsab elmi ərəb qəbilələrinin, peyğəmbərlərin, xəlifələrin, məşhur alimlərin və s. nəsəbini öyrədən elmdir.

[18] **"Hikməti-təşri"**, dini hökmlərin **hikmət** və sirlərindən bəhs edən elmdir. Dini əmr və qadağaların hikmətini açıqlayan elm də demək olar.

606/1209), Zeynəb bint Əbdürrəhman əş-Şəriyyə (v. 615/1218) və Əcibə bint Əbə Bəkr əl-Bəqdəriyyədir (v. 647/1249).

### *4) Ümmü Zeynəb Fatima binti Abbas (r.a)*

Bağdadlı olan Fatimə bint Abbas Qahirədən kənarda Ərəfə günündə vəfat etmişdir. Cənazə mərasimində böyük bir izdiham olmuşdur. Alimə və fəzilətli qadınlardan idi. Yaxşılığı əmr edər, piş işləri qadağan edərdi. Bir çox qadına Qurani- Kərimi xətm etdirmişdir.

### *5) İlk müsəlman şəfqət bacısı Rüfeydə bint Səd (r.a)*

İslam tarixində ilk şəfqət bacısı olan Rüfeydə bint Səd, yaralıları müalicə etmək üçün bir çox müharibədə iştirak etmişdir. Qız uşaqlarının cahiliyyə adətləri ilə sərt mübarizə aparan Rüfeydə, təhsil almış şəfqət bacılarının idarə etdiyi ilk səhra xəstəxanasını quran şəxs olaraq da İslam tarixində mühüm bir yerə sahibdir.

Rüfeydənin atası Səd insanları müalicə etməklə məşğul olan bir təbib idi və bu sevgisini qızına da aşılamışdı. Qızı isə xəstələri şağaltmaqla yanaşı, qız uşaqlarının cahiliyyə adətləri ilə də sərt mübarizə aparmağa çalışmışdır. Babasının: "Qızım! Bütün həyatımı sənə həsr etdim. Elmimi və təcrübəmi sənə verdim. Səni, məndən sonra Əsləm oğullarının yaralılarını müalicə edən və ağrılarını yüngülləşdirən bir şəfqət bacısı olmağa hazırladım" sözlərini vəsiyyət qəbul edən Rufeydə, ömrünü insanlara şəfa qaynağı olmağa həsr etmişdir.

İslamın ilk dövrlərində şəfqət bacısı və buna bənzər işləri görən çox sayda qadınlar vardır. Onlar xüsusən müharibə gedən məkanlarda müalicə edərdilər. İlk dövr qadınların şəfqət bacılığı ilə yanaşı, xüsusilə, hədis, fiqh, ədəbiyyat və təhsil məsələlərində də fəal olduqları anlaşılır. Buna Peyğəmbərin ﷺ nəslindən gələn və əslən Yəmənli olub Şamda yaşayan Fatimə bint Səd əl-Xeyir adlı hədisşünas xanım gözəl bir misaldir.

### *6) Fatimə bint Sad əl-Xeyir*

13-cü əsrdə yaşamış Fatimənin ən diqqət cəlb edən tərəfi, İspaniyanın Valensiya şəhərindən Çinə qədər davam edən bir elm səfəri etməsidir. Səfəri əsnasında ziyarət etdiyi şəhərləri (Qahirə, Şam, Bağdad, İsfahan, Rey, Nişapur, Tus, Buxara, Səmərqənd, Qaşğar) göstərən xəritənin mövcudluğu, onun bu elm səfərini qeyri-adi edir.

### *7) Nüseybə bint Kəab əl-Maziniyyə (r.a)*

Ühüd (625), Bəni Qurəyzə döyüşlərinə, Hüdeybiyyəyə, Xeybərin fəthinə, Ümrətül-Qazaya, Məkkənin fəthinə, Hüneyn və Yəmənə müharibəsində iştirak etmişdir. Müsəlman yaralı əsgərlərə şəfqət bacısı kimi xidmət etmiş və Ümmü Ümarə olaraq da tanınmışdır.

***8) Ümmü Sənan əl-İslami (r.a)***

O, müsəlman olduqdan sonra Peyğəmbərə ﷺ yaralı müsəlmanları müalicə etmək, su daşımaq, susuzlara su vermək və su tuluqlarını tikmək kimi işləri görə biləcəyini söyləmişdir. Eləcə də, Xeybər döyüşünə qoşulmaq üçün izn istəmişdir.

***9) Ümmü Matəvə əl-İsləmiyyə (r.a)***

Xeybər döyüşündən sonra könüllü olaraq orduda şəfqət bacılığı etmişdir.

***10) Ümmü Vərəqa bint Haris (r.a)***

Ümmü Vərəqa, Bədr döyüşündə şəfqət bacısı olmuş və eləcə də Qurani-Kərimin toplanması işinə qoşulmuşdur.

***11) Əş-Şəfa bint Abdullah əl-Qüreyşi (r.a)***

Son dərəcə ağıllı bir qadın olan əş-Şəfa idarə işləri ilə də məşğul olub həm şəfqət bacısı, həm də digər tibbi işlərdə iştirak etmişdir. Qarışqa sancmalarına qarşı bir müalicə üsulu işlətmişdir, bu məsələdə Peyğəmbər ﷺ onu başqa qadınlara öyrətməsi üçün vəzifələndirmişdir. Əş-Şəfa, Ömər (r.a) dövründə bazarda müfəttiş olaraq təyin olunmuşdur.

***12) Cəbr elmində istedadlı olan Süteytə əl-Məhaməli***

Eyni əsrdə Bağdadda yaşamış Süteytə əl-Məhaməli (ö/987) də yaxşı təhsil alan xanımlardandır. Savadlı bir ailədən olan Süteytə, atasından və dövrünün tanınmış alimlərindən dərslər oxudu. Ərəb ədəbiyyatı, hədis və fiqh elmlərilə yanaşı riyaziyyatda diqqəti cəlb edən bir səviyyəyə çatmışdır. Mənbələrə görə, hesab və fəraiz (miras hesablamaları) məsələlərində çox bilikli idi ki, riyaziyyatın bu məsələləri onun vaxtında təzə inkişaf etməkdə idi. Həmçinin cəbr elmində çox qabiliyyətli idi və digər riyaziyyatçılar tərəfindən ortaya qoyulan bəzi tənlik problemlərinin həllində yeni üsullar gətirmişdir.

***13) Astronomiya ilə məşğul olan Fatima əl-Məcritiyyə***

Əndəlüsdə astronom və riyaziyyatçı Məsləmə əl-Məcritinin (ö/1007) qızı Fatima əl-Məcritiyyə (Madridli Fatima) də atası kimi astronomiya ilə məşğul olmuş, üstürlab (astrolyabiya) alətinin düzəlməsində, planetlərin və ulduzların məkanlarını göstərən tabloların hazırlanmasında atasının yazdığı əsərlərə yardım etmişdir.

***14) Sarayın alimə qadını Qurtubalı Lübna***

Qurtubalı Lübna, 10-cu əsrdə Əməvi hökmdarı Sultan 3-cü Əbdürrəhmanın səltənəti altında sarayda böyümüş bir elmli qadındır. Fərqli sahələrdə istedadları olduğu qeyd edilmişdir. Ona aid edilən xüsusiyyətlərdən bəziləri şairliyi,

katibliyi, yazıçılığı və riyaziyyat sahəsindəki dahiliyi idi. Yaxşı bir riyaziyyatçı olması, onun saray kitabxanasının başına keçməsinə səbəb olmuşdu.

Kitabaxananı beş yüz mindən çox kitabla təmin edərək dövrün ən böyük kitabxanalarından biri olmasına dəstək olmuşdur. Qahirə, Bağdad və Şama səyahətlər edib kitabxana üçün elmi materiallar toplamışdır. Qurtubalı Lübna, Oklid və Arximed kimi önəmli alimlərin kitablarına öz əməyini və şərhlərini də əlavə edərək saray kitabxanasını təmin edirdi.

### *15) Dünyanın ilk universitetinin banisi Fatima Muhamməd əl-Fixri əl-Qureyş*

Hədis elmində gözəl bir təhsil almış, gənc yaşında dul qalıb atasından və ərindən qalan mirasını Mərakeşdə Əl-Qərəviyyin adında bir məscid və universitet qurmaq üçün xərcləmişdi. Bu universitet Əl-Əzhərdən, Oksforddan çox əvvəl qurulan bir universitet olmuşdur. 859-cu ildə tamamlanan bina dünyanın ən qədim universitetlərindən biri olaraq qəbul edilir. Açıldıqdan sonra müxtəlif şəhərlərdən çoxlu tələbə bura təhsil almağa gəlmişdir. Son dərəcə nizam-intizamlı bir təhsilin verildiyi universitetdə İslami elmlərlə yanaşı astronomiya, riyaziyyat, ədəbiyyat, xarici dillər və fənn elmləri də öyrədilirdi. Ərəb rəqəmləri bu təhsil qurumu sayəsində Avropada tanınmış və istifadə edilmişdir. Əvvəllər bir məscid ikən dünyanın ilk ali təhsil müəssisəsi olmuşdur.

## *Azərbaycanın məşhur qadınları*

### *1) Məhsəti Gəncəvi*

XII əsrdə yaşamış mənşəcə Azərbaycan türklərindən olan şairə, sufi Əxi təriqətinin üzvü idi. Hər şeydə birincilik qazanmış Məhsəti xanım Gəncəvi, Azərbaycanın ilk məşhur şairəsi olmuşdur. Onun tərcümeyi-halı müəmmalı olduğuna görə şairənin həyatı barədə məlumatlar çox azdır. Məhsəti Gəncəvi təqribən 1089-cu ildə Gəncə şəhərində doğulmuş və ömrünün sonuna qədər burada yaşamışdır.

### *2) Azərbaycan şairəsi Heyran xanım (1790/Naxçıvan – 1848/Təbriz)*

Heyran xanım XVIII əsrin sonlarında Dünbuli Kəngərli xanları ailəsində doğulmuşdur. Naxçıvanda təhsil almış, ərəb və fars dillərini, klassik Azərbaycan və fars ədəbiyyatını öyrənmişdir. XIX əsrin 60-cı illərində vəfat etmişdir. Füzuli ədəbi məktəbinin davamçılarından, klassik Azərbaycan poeziyasının tanınmış nümayəndələrindəndir.

### *3) Azərbaycanın görkəmli şairə-qadını Xurşidbanu Natəvan*

Natəvan 15 avqust 1832-ci ildə Şuşada anadan olmuşdur. Mehdiqulu xan qızına öz anası Xurşudbanunun adını vermişdir. Xurşudbanu ailənin yeganə övladı, həm də Qarabağ xanlıqlarının sonuncu vərəsəsi olduğu üçün, onu sarayda «Dürrü yeкta» (Təк inci), el arasında isə «Xan qızı» çağırmışlar. Xurşidbanu Natəvan parlaq istedada və qabaqcıl ideallara malik olan şəxsiyyət olmuşdur. O, Azərbaycan mədəniyyətində və ictimai həyatında dərin izlər qoymuşdur. Natəvanın yaradıcılıq fəaliyyəti təkcə şeirlə bitmir. O rəssamlıqla da məşğul olurdu, həmçinin, onun nəfis əl işləri, müxtəlif janrda tikmələr bacarığı da olmuşdur. 1973-cü ildə Şuşaya su kəmərini çəkdirmişdir: bu su kəməri indi də "Xan qızı bulağı" adı ilə məşhurdur. Natəvan Araz çayından Mil düzünə də su kəməri çəkməyə təşəbbüs etmişdir.

### *4) Fatma xanım Kəminə*

XIX əsr Azərbaycan ədəbiyyatının tanınmış numayəndələrindən idi. 1841-ci ildə Şuşada ziyalı ailəsində anadan olan və "Fəna" təxəllusu ilə şeirlər yazan Ağa Mirzə Bəybaba Tahirzadənin qızıdır. Onun həyat və yaradıcılığı haqqında XIX əsr təzkirələrində az da olsa məlumat vardır. Məsələn, Mir Möhsün Nəvvab "Təzkireyi-Nəvvab" əsərində Kəminə xanım haqqında məlumat verərkən bildirmişdir ki, o, dörd yüzə yaxın şeir yazmış, Şuşada Mir Mövsün Nəvvabın başçılıq etdiyi "Məclisi-fəramuşan"da yaxından iştirak etmişdir. Şeirlərini Azərbaycan və fars dillərində yazan Fatma xanım Kəminə şairə Natəvanın başçılıq etdiyi "Məclisi-üns" ədəbi məclisinin üzvləri ilə yaxın olmuş, onlarla şeirləşmişdir.

## *III - Qadınların ictimai həyatı*

İslamda qadının ictimai həyata qoşulması müəyyən qaydalar daxilində caizdir. Eyni şəkildə kişilər də məlum qaydalara riayət etməlidir. Lakin qadınlar, həm fiziki, həm də psixoloji olaraq daha incə və kövrək olurlar. Bu baxımdan Allah Azzə və Cəllə Qurani-Kərimdə qadınlar üçün tədbir görərək açıq-aydın qaydalar qoyur: "**Ya Peyğəmbər! Zövcələrinə, qızlarına və möminlərin zövcələrinə de ki,** (evdən çıxan zaman) **cilbablarını örtsünlər. Bu onların tanınmaları və incidilməmələri üçün daha münasibdir. Allah bağışlayandır, rəhimlidir!"[19]** Bu ayə, əslində örtünmənin qadınları qoruyan və ucaldan bir əmr olduğunu açıq şəkildə bildirir. "Qadının ictimai həyata qoşulması qadağandır" düşünmək, yanlış anlayışdır. Məhz bu ayə, onların ehtiyaclarını ödəmək üçün cəmiyyətə qarışmalarının caiz olduğunu göstərən bir dəlildir. Çünki evdən çıxmaları caiz olmasaydı, üst geyim geyməlөri də əmr edilməzdi. Bu da, qadınların ictimai həyata qarışmasının caiz olduğunu göstərir.[20]

Həmçinin qadınların məhkəmələrdə şahidlik edə bilməsi[21], kişinin iddət gözləyən bir qadına üstü bağlı bir şəkildə evlənmək istədiyini bildirməsi[22], çobanlıq edən qızların heyvanlarını naməhrəm bir kişi olan Musa (əleyhissəlam) ilə eyni sudan su içirdikləri barədə danışdıqları xəbər verilmişdir[23]. Bütün bunlardan qadınların ictimai həyata qoşulmasıının dinimizə görə qadağan olmadığının təzahürüdür.[24] Eləcə də, Qurani-Kərim, mömin kişi və qadınların bir-birinin dostu olduqlarını, yaxşılığı əmr edib, pislikdən çəkindirdiklərini[25] xəbər verir. Deməli, bu vəziyyət ancaq onlar arasında qarşılıqlı bir münasibət olduğunda həyata keçir. Həm də, hər iki cinsin gözlərini harama baxmaqdan çəkinməsi və övrət yerlərini örtməsi[26], onların ictimai mühitdə bir yerdə olmalarına əngəl törətmir.

Ömər (r.a) xəlifəliyi dövründə bir gün minbərə çıxıb qadınlara çox mehir verilməməsini istəmişdir. Camaat içində olan bir qadın ayağa qalxıb ayələrdən misallar gətirərək[27] ona etiraz etmiş və fikrini də isbat etmişdir. Bundan sonra Ömər (r.a) öz fikrindən dönmüşdür.[28] Bu hadisə, səhabə dövründə qadınların

---

[19] Əhzab 33/ 59.
[20] Əbu Mənsur Əl-Maturidi, "Təvilətu əhl-is-sunnə", 8/415. Beyrut, 2005.
[21] Bəqərə 2/282.
[22] Bəqərə 2/235.
[23] Qasəs 28/23-28.
[24] Əbu Abdullah Əl-Qurtubi, "Əl-Cami' li əhkəm-il Quran", 16/258, Beyrut, 2006.
[25] Tövbə 9/71.
[26] Nur 24/30-31.
[27] Nisa 4/ 20-21.
[28] Əbul Fida' İbn Kəsir, "Təfsir-ul Quran-il azim", 2/243-244, ər-Riyəd, 1999.

məscidlərə getdiklərini və orada fikirlərini açıq şəkildə və rahatlıqla ifadə edərək haqlarını qoruduqlarını göstərir.

Deməli, bütün sadaladıqlarımız qadının ictimai həyata qoşulmasını və orada fəal iştirak edə biləcəyini bir daha sübut edir[29].

---

[29] İbrahim Yıldız, "Quran və Sünnəyə görə ictimai həyatda qadın-kişi münasibəti", Harran Universiteti İlahiyyat fakültəsinin jurnalı, N 42, 07-12/ 2019.

# İkinci fəsil

# Qadınların ümumi fiqh əhkamları

- **İslamın qız övladına və qadına verdiyi dəyər**
- **Qızların təlim və tərbiyəsi**
- **Qadınların inancı və əxlaqi keyfiyyətləri**
- **Övladlığa götürmə və himayədarlıq**
- **Qadınların vətəndaşlıq haqları**

## *I - İslamın qız övladına və qadına verdiyi dəyər*

İslam, övlad istəməsinə və nəslin artmasına təşviq edir və onu evliliyin əsas məqsədi edir. Allah Təala ümmətə cinsi əlaqəni, hətta onu oruc gecəsi dan yeri sökülənə qədər də mübah edir, tərki-dünyalığı isə qadağan edir. Kişi və qadın bir tək cinsi istəklərinə görə yaxınlıq etməyib, ailə münasibətlərində Allah rizasını gözləyərlər. Onlar Uca Allahdan elə bir saleh övlad diləyərlər ki, Ona ibadət etsin, heç bir şeyi Ona şərik qoşmasın və ölümlərindən sonra onlara dua etsin. Çünki, Allah Rəsulu ﷺ buyurur: **“Bəndə axirətdə dərəcəsinin artdığını görüb soruşar: “Rəbbim, bu mənim üçün hardandır?” Buyurular: “Övladının səndən sonra sənin üçün etdiyi istiğfardır”**[30].

“Səhih Buxari” və “Səhih Müslim”də Peyğəmbərin ﷺ qadınlara buyurduğu belə bir hədis var: **“Sizdən hər kimin üç övladı öldüsə, bu övladlar onu Cəhənnəm odundan qoruyarlar”.** Qadınlardan biri: “Bəs iki övladdırsa? Çünki mənim iki övladım öldü” deyincə, Allah Rəsulu ﷺ: **“İki övlad da eyni şəkildədir”** cavabını verdi”[31].

Allah-Təala qızları xor görüb qəzəblənməyi qadağan edir: “**Göylərin və yerin hökmranlığı Allaha məxsusdur. O, istədiyini yaradır. O istədiyinə qız, istədiyinə də oğlan verər. Yaxud onlara oğlan və qız uşağı olmaqla hər ikisindən verər. İstədiyini də sonsuz** (övladsız) **edər. Şübhəsiz ki, O hər şeyi biləndir, hər şeyə qadirdir!”**[32]

Bundan başqa, Aişədən (r.a.) gələn rəvayətdə Allah Rəsulunun ﷺ qız övladlarına verdiyi dəyər ibrətamizdir: “Yanında iki qızı olan bir qadın gəlib bir şey istədi. Tərslikdən yanımda bir xurmadan başqa heç nə yox idi. Onu verdim və xurmanı götürüb qızları arasında iki yerə böldü, lakin özünə bir şey ayırmadı. Sonra qızları ilə çıxıb getdi. Ardından Allah Rəsulu ﷺ daxil oldu və ona olanları danışdım. Buyurdu: **“Kim bu şəkildə qızlarla imtahan edilib, o da onlarla yaxşı rəftar edərsə, qızlar onun üçün oda qarşı pərdə olurlar”**[33].

Allah-Təala “ən-Nisa” surəsində qadınlar barədə buyurur: “ **...Onlarla yaxşı davranın**. **Ola bilsin ki, sizin xoşlamadığınız bir şeydə Allah** (sizin üçün) **çoxlu xeyir nəzərdə tutmuşdur”**[34].

Dünya və axirət xeyri olan qız övladlarını sevməmək, Allahın bəndəyə bəxş etdiyini, Onun riza göstərdiyini bəyənməməkdir. Bunun necə bir yaxşı iş olmadığını bilmək vacibdir.

Yaqub bin Buxtən dedikləri burda yerinə düşər: **“Mənim yeddi qızım oldu və hər dəfə qızım doğulanda, Əhməd bin Hənbəl yanıma gəlib mənə**

---

[30] İbn Macə, “əs-Sünən”, “Ədəb”, 3942, 3660.
[31] Buxari, “əs-Səhih”, “Elm”, 101.
[32] Şura, 42/49,50.
[33] Buxari, “əs-Səhih”, “Zəkat”, 1397.
[34] Nisa 4/19.

**deyərdi: "Ey Əbu Yusif, peyğəmbərlər qız ataları olmuşlar". Onun söylədikləri narahatlığıma son qoyurdu"**[35].

### *Doğumdan sonra övladlar üçün edilən əməllər*

Doğumdan sonra qız və ya oğlan övladı üçün ediləcək ilk əməl, sağ qulağına əzan və sonra sol qulağına iqamə oxumaqdır. Çünki bunu Allah Rəsulu ﷺ tövsiyə etmişdir və özü də nəvəsi Həsənin (r.a) sağ qulağına əzan, sol qulağına isə iqamə oxumuşdur.[36] Ona görə bunları edərək uşağa ad qoymaq, sünnət bir əməldir. Bu işi atası və ya ailə böyüklərindən biri də edə bilər.

Əzan oxumanın hikməti, əvvəla, Rəbbimizin böyüklüyünü və əzəmətini göstərən sözlərin insan qulağına həkk olunmasındadır. Eynilə, bir insan İslama ilk daxil olduğunda kəlmeyi-şəhadəti gətirdiyi kimi, dindən çıxdığı zaman da həmin kəlmələri gətirir. Əzanın qəlbə təsiri və buraxdığı iz hiss olunmasa da, onunla şeytan qorxub vəsvəsə etməkdən çəkinər.

Bundan başqa, yeni doğulan uşağa xurmayla təhnik edilməsi müstəhəbdir.[37] Əbu Musadan (r.a.) belə rəvayət edilmişdir: "Bir oğlum dünyaya gəldi və onu Peyğəmbərə ﷺ gətirdim. Ona İbrahim adını verdi və bir quru xurmayla təhnik etdi. Sonra uşağa dua edib bərəkət dilədi və mənə verdi"[38].

Digər bir rəvayət Əsma bint Əbu Bəkrdən (r.a) nəql olunur: "Abdullah bin Zübeyrə Məkkədə hamilə idim və Qubada onu dünyaya gətirdim. Sonra uşağı Allah Rəsuluna ﷺ gətirib hücrəsinə qoydum. Bir xurma istədi və onu bir müddət ağzında isladaraq yumşaltdıqdan sonra körpənin damağını bu xurma ilə ovdu. Sonra dua edib bərəkət və xeyir dilədi. Bu uşaq İslamda ilk doğulan uşaq idi və onunla çox sevinirdilər. Çünki onlara bəzi insanlar deyərdi: "Həqiqətən yəhudilər sizə sehr etdiklərinə görə uşağınız olmayacaq"[39].

---

[35] İbn Qayyim əl-Cəuzi, "Tuhfət-ul məudud bi əhkəm-il məulud", 35.
[36] Beyhaqi, "Şu'ab-ul-iman", 11/ 105-106.
[37] Hərfi mənada "çeynəmək və damağa sürtmək" deməkdir. Aişədəm (r.a) gələn rəvayətə görə təzə doğulan uşaqlar Peyğəmbərə ﷺ gətirilir, o da mübarək, xeyirli olmaları üçün onlara dua edər və təhnik edərdi. Ona görə İslamda bu işə **təhnik** adı verilmişdir.
[38] Buxari, "Səhih", "Əqiqə", 5150. Təhnikin hikməti odur ki, xurmanı əmməklə uşağın ağız əzələləri qüvvətlənsin və sonra ana südünü əmə bilsin.
[39] Buxari, "Səhih", "Əqiqə", 5152-ci hədis.

Ad qoymanın vacibliyi, Peyğəmbərin ﷺ hədislərində öz təsdiqini tapmışdır: “Siz Qiyamət günündə həm öz adınızla, həm də atalarınızın adıyla çağrılacaqsınız. Bu səbəblə özünüzə gözəl adlar qoyun”.[40]

Ad qoymanın vaxtı barədə Peyğəmbərimiz belə buyurur: **“Təzə doğulan uşağa yeddinci günü ad qoyulsun”** [41] . Digər hədisdə Allah Rəsulu ﷺ: “**Yeddinci günü uşağa ad qoyulub əqiqə qurbanı kəsilsin” -** buyurur**.**[42]

Həmçinin, Peyğəmbərdən ﷺ ad seçimi barədə hədisi-şərif gəlmişdir: “Munzir bin Üseyd doğulan vaxt Allah Rəsuluna ﷺ gətirilir və dizinin üstünə qoyulur. Atası Üseyd oturduqdan sonra Peyəmbər ﷺ belə buyurdu: **“Adı nədir?”** Filan, ey Allahın Rəsulu – deyə cavab gəldi. “**Xeyr, onun adı Munzir olsun”** – buyurdu.**[43]**

Allah Rəsulu ﷺ qızlarının adını özü qoymuş və Fatimə əz-Zəhranın oğullarına Həsən, Hüseyn və Mühsin adını vermişdir. Qız nəvəsi Ümmü Külsüm bint Əliyə isə, xalası yəni Allah Rəsulunun ﷺ qızı Zeynəbə çox oxşadığına görə “Zeynəbul-vusta” künyəsi qoymuşdur. Bərrə bint Cəhşə və Bərrə bint Ümmü Sələməyə də Zeynəb[44] adı verilmişdir.

Peyğəmbərin ﷺ bəzi şəxslərin, məkanların, qəbilələrin və dağların adları xoşuna gəlmirdi. Belə ki, Allah Rəsulu ﷺ bir dəfə iki dağ arasında keçirdi və onların adlarını soruşdu: “Fədəh və Məxaz” – deyə cavab verdilər. Peyğəmbər ﷺ çox məyus oldu və dağlardan geri çəkilib aralarından keçmədi.

Yuxarıdakı hədislərdən belə nəticəyə gəlmək olar ki, adlar insanın əxlaqına, əməlinə müəyyən iz qoyur. Ona görə övladlarınıza ad seçərkən diqqətli olun, mənalarını araşdırmadan qoymayın. Buna görə Allah Rəsulu ﷺ adları gözəlləşdirməyi buyuraraq deyir: **“Adlarınızı gözəlləşdirin”**.[45]

Ad qoymada bir və daha çox ad caiz olduğu üçün, hər kəs özünə mənası gözəl olan künyə və ya ləqəb seçə bilər. “Səhih Buxari”də belə bir hədisi-şərif gəlmişdir: **“Mənim beş adım var. Mən Muhamməddəm. Mən Əhmədəm. Mən o Mahiyəm ki, Allah küfrü mənimlə məhv edir. Mən o Haşirəm ki, insanlar mənim arxamda toplanır. Mən Aqibəm. Aqib özündən sonra peyğəmbər gəlməyəndir.”**[46]

---

[40] Əbu Davud, “Ədəb”, 61; Müsnəd, 5/194.
[41] Tirmizi, “Qapılarda izn istəmə”, 2989.
[42] Əvvəlki mənbəyə bax.
[43] Buxari, “Səhih”, “Ədəb”, 5838.
[44] Müslim, “Səhih”, “Ədəb”, 2142.
[45] Əbu Davud, “Adların dəyişdirilməsi”, 4948; İbn Qayyim Əl-Cəuzi, “Tuhfət-ul məudud”, 123.
[46] Buxari, “Səhih”, “Mənaqib”, 3339.

### *Əqiqə qurbanı*

Allah-Təalaya şükranlığını bildirmək üçün təzə doğulan uşağa “əqiqə” qurbanı kəsilir. Hədislərdə gəldiyi kimi, Peyğəmbər ﷺ öz nəvələri Həsən (r.a) və Hüseyn (r.a) üçün əqiqə qurbanı kəsmişdir.[47]

Bu barədə Allah Rəsulu ﷺ buyurur: **“Hər uşaq doğumunun 7-ci günündə özü üçün kəsiləcək əqiqə qurbanı qarşılığında bir girov kimidir. Əqiqə qurbanı kəsildikdən sonra uşağın başı təraş edilir və ona ad qoyulur.”**[48]

Əqiqə qurbanı kəsmək, məzhəbimizə görə mubahdır.[49] Əqiqə qurbanı, uşağın doğulduğu gündən həddi-büluğ yaşına qədər kəsilə bilər, lakin doğumun 7-ci günü kəsilməsi daha fəzilətlidir.

---

[47] Əbu Davud, Dəhayə, 21; Nəsai, Aqiqa, 1.
[48] Əbu Davud, Dəhayə, 21.
[49] Digər məzhəblərə görə isə sünnətdir.

## *II - Qızların təlim və tərbiyəsi*

Yaxşını pisdən ayırd etmə yaşından etibarən, oğlan və qızlara dünyəvi fənlərlə yanaşı, Qurani-Kərimin tilavəti, Peyğəmbərin ﷺ həyatı, bəzi ədəbi-tərbiyəvi hekayələr, rəvayətlər və Sünnətə uyğun olan ata sözlərini öyrətmək, hər bir valideynin vəzifəsidir.

Səhabələr də, Peyğəmbərin ﷺ tövsiyəsinə qulaq verib bunları böyük şövqlə həyata keçirmişlər. Burda Ömər bin Xattab (r.a) valilərə yazdığı sözləri mövzuya bir nümunədir: **"Övladlarınıza üzməyi, at minməyi və ox atmağı öyrədin".**

İmam Şafii demişdir: **"Hər kəs Qurani-Kərimi öyrənərsə, onun dəyəri artar, fiqh öyrənən şəxsin şərəfi artar, hədis yazanın dəlili, hüccəti qüvvətlənər, dil öyrənən kəsin xasiyyəti yumşalar və hesab (riyaziyyat) öyrənən kəsin isə, fikri zənginləşər".**

Fiqh alimləri, qızların və qadınların kişilərlə bərabər səviyyədə təhsil alması barədə icma olmuşlar. Bunun səbəbi aşağıdakılardır:

1- Qadınla kişinin şər'i mükəlləfiyyətləri eynidir.
2- Qadının da, kişinin də, axirət mükafatına nail olmağa bərabər haqları var.

Biz bu örnəyi Peyğəmbərin ﷺ hədisində şahidi oluruq. Allah Rəsulu ﷺ Allah-Təalanın ona bəxş etdiyi elmdən qadınlara da öyrətmək üçün xüsusi günlər ayırmışdır: "Peyğəmbərin ﷺ yanına bir qadın gəlib belə dedi: "Ey Allahın Rəsulu, kişilər sənin söhbətinə gəlir. Bizim üçün də bir gün ayır ki, sənin hüzuruna gələk və bizə Allahın öyrətdiyindən öyrədəsən. Allah Rəsulu ﷺ buyurdu: **"Bu və bu günlərdə toplanın".** Beləliklə, Peyğəmbər ﷺ gəlib qadınlara elm tədris edirdi.[50]

İslamda elm və mədəniyyətin ən yüksək səviyyəyə çatmasını bizə tarix sübut edir. Çünki, yazıçı və şairlik istedadı müsəlman qadınlarda da olmuşdur. Buna misal olaraq, ərəb xanımlarından Üleyyə bint əl-Mehdi, Aişə bint Əhməd bin Qadim, azərbaycanlı xanımlardan isə Xurşudbanu Natəvan, Məhsəti Gəncəvi və başqalarıdır.

Təbibə xanımlardan - göz xəstəliklərini müalicə edən, təbibə Zeynəb bəni Əud və tibbdə məşhur olan Ümmül Həsən bint əl-Qazi Əbu Cəfər ət-Tancəli, azərbaycanlı təbibələrdən isə ilk azərbaycanlı göz həkimi Sona xanım İbrahim qızı Vəlixan və ilk şəfqət bacısı və ilk ali təhsil alan azərbaycanlı qadın Nigar Hüseyn Əfəndi qızı Şıxlinskaya olmuşdur.

Mühəddisə qadınlardan - Kərimə əl-Mərvəziyyə, Nəfisə bint Muhamməddir. Həmçinin hədis ravilərindən biri olan Hafiz İbn Əsəkir, qadın ustadların və şeyxlərin səksəndən yuxarı sayını qeyd etmişdir.

[50] Buxari, "Səhih", "Elm", 101.

Şeyx Əli bin Üteyyə əl-Həbətinin tərcümeyi-halında belə bir məlumat var ki, onun şeyxlərindən biri Aişə bint Muhamməd bin Əbdülhədi idi. O, öz şeyxlərindən təkbaşına hədis eşidib rəvayət edən Hənbəli mühəddisəsi olmuşdur.

Qadın alimlərdən bir çoxları yüksək elmi dərəcələrə nail olmuşlar. Onlardan bəziləri İmam Şafiinin, İmam Buxarinin, İbn Xalkənin və İbn Hayyənin müəllimələri olmuşdur ki, bunların hamısı məşhur fiqh alimləri olmuşlar. Qadınların elmə diqqət və maraq göstərmələri, intelektual səviyyələrinin inkişafına ən böyük bir dəlildir. Onların İslam elmi və mədəniyyətində özünəməxsus məqamları var.

## *Valideynlərin məsuliyyəti*

Valideynlərin övladlarına qarşı nə dərəcədə məsuliyyətli olması, Peyğəmbərimizin ﷺ hədisində açıqca görülür: "**Hamınız çobansız, otardığınız sürüdən məsuliyyətlisiz. Kişi də, ailəsinin çobanıdır və sürüsündən məsuldur. Qadın, ərinin və evinin çobanıdır və sürüsündən məsuldur. Xidmətçi, sahibin malının çobanıdır; o da sürüsündən məsuldur. Nəticədə hamınız çobansınız və otardığınız sürüyə cavabdehsiniz".**[51]

Valideynlər övladların Quran və Sünnətdə buyrulan vacib əməllərə riayət etmələrində məsuliyyət daşıyırlar. Bunlardan biri də, onlara fayda verəcək və islah edəcək elmləri öyrənməkdir. Dünyəvi elmlərlə yanaşı, islami elmləri - əqidə və şəriət əhkamların və s. öyrənilməsinə diqqət göstərməlidirlər. Eyni zamanda, valideynlərin vəzifəsi, övladlarını əxlaqi və mənəvi dəyərlərin itirildiyi indiki cəmiyyətdə azğınlığa və batil meyillərə yönələn amillərdən qorumaq və bunlara qarşı hər zaman mənfi mövqedə dayanmaqdır.

Övladlara İslamın vacibatlarını ancaq nəzəri deyil, namaz, oruc və digər ibadətləri əməli olaraq tətbiqini tələb etmək də, valideynlərin məsuliyyətlərindən biridir. Çünki, Allah Rəsulu ﷺ buyurur: "**Uşaqlarınıza yeddi yaşında ikən namaz qılmalarını söyləyin. On yaşına girdiklərində qılmasalar onları cəzalandırın və yataqlarını da ayırın".**[52]

Hədis belə şərh edilmişdir: "Yeddi yaşına çatdıqda övladlarınızı namaza hazırlamaq üçün fərz namazların vacib olduğunu söyləyin və onları namaz qılmağa sövq edin. On yaşına çatdıqda isə, namazı tərk etdiklərinə görə lazım gələrsə, onları vurun[53]. On yaşında ikən, (bacılarına qarşı olsa belə, şəhvətə

[51] Buxari, "Səhih ", "Cümə", 853.
[52] Əbu Davud, "Sünən", "Namaz", 495.
[53] Yəni öyüd-nəsihətə qulaq asmamaqda inad göstərən uşaqlar məzəmmət edilməli, bu da işə yaramazsa, bir yerini incitməyəcək şəkildə vurmağa icazə verilmişdir. Bu tərbiyə prinsipi alimlər tərəfindən qəbul edilmişdir. Şübhəsiz ki, uşağı vurmaq, ancaq məcbur olunduğu zaman müraciət ediləcək tərbiyə şəklidir. Bu yola əl atana qədər məzəmmət etmək, qorxutmaq, qulağını çəkmək kimi müxtəlif tərbiyə üsulları vardır. Özü heç bir uşağa əl qaldırmayan və onlara qarşı mərhəmət və şəfqət göstərilməsini əmr edən Peyğəmbər ﷺ on yaşına gəldiyi zaman namaz

meyl göstərməmələri üçün) övladlarınızın yataqlarını ayırın. Namazla yanaşı, valideynlər övladlarını orucu da alışdırmalıdırlar. Həddi-büluğ yaşına çatmadıqlarına görə alışmaları üçün onlara bəzi günlər, (məsələn, həftənin 1-ci və 4-cü günləri sünnət sayılan) oruc tutmaları məqsədə uyğundur. Eləcə də, Allahın Kitabından rahat və asan surələri əzbərlətməyə çalışın və onları buna təşviq edin."

---

qılmayan uşaqların yüngül şəkildə vurmağa icazə vermişdir ki, bu da namazın nə qədər önəmli olduğunu göstərir.

## *III – Qadınların inancı və əxlaqi keyfiyyətləri*

### *Qadınların əqidəsi*

Hər bir müsəlmanda sağlam islami təfəkkürün, gözəl davranışın, əxlaqın formalaşması, dünya işlərinə az meyl göstərib daha çox axirətini qazanmaq üçün çalışması və həyatda hansı qayəyə görə yaşadığını bilməsi üçün islami dəyərlərdən tutunması şərtdir. Yalnız o zaman bir islami şəxsiyyət formalaşar. Bu da, öz növbəsində savadlı şəxsiyyətlərin cəmiyyətdə çoxalması, haqqın gerçəkləşməsinə və batilin məhvinə yardım edənlərin artması və sağlam islami bir nəslin yetişməsi deməkdir.

Kişilər və qadınlarda əqidə, Allah-Təalanın tövhidi, Onun Rübubiyyətdə və Uluhiyyətdə[54] təkliyini tanıması ilə təşəkkül tapır. Eləcə də, hər bir müsəlman əqidəsini öyrənməklə, gizlini də, aşkarı da bilən, işlərin batinindən xabir (xəbərdar) olan Allahı tanıyır və bununla inancının təməli qoyulur. Allah-Təalanın kəlamı bunu təsdiqləyir: **"**(Loğman oğluna belə nəsihət etdi) **Ey oğlum! Şübhəsiz,**(etdiyi yaxşı və ya pis iş) **xardal dənəsi ağırlığında olub, bir qayanın içində, yaxud göylərdə və ya yerin içində olsa belə, Allah onu** (sənin qarşına) **gətirər. Həqiqətən, Allah lətifdir** (ən gizli və ən incə işləri də görəndir), **hər şeydən xəbərdardır!"[55]**

Əqidə, öğlanda və qızda eyni dərəcədə olub onlara saleh insan olmasını, başqasının islah olunmasında vasitəçilik edərək, yaxşı işlər görməyi buyurub pis işlərdən çəkindirməyi öyrədir. Loğman surəsinin 17-ci ayəsində bunun şahidi oluruq "**Ey oğlum, namaz qıl, yaxşı işlər görməyi əmr et və pis işlər görməyi qadağan et! Başına gələn müsibətlərə də səbr et! Həqiqətən, bunlar əzmkarlıq tələb edən işlərdir!"**

Burda Allahın insana təqdir etdiyi qədəri unutmamaq lazımdır: "**Bütün bir ümmət toplanıb sənə faydalı olmağa çalışsalar, ancaq Allahın sənin üçün təqdir etdiyi faydanı təmin edə bilərlər. Yenə əgər bütün ümmət sənə zərər vermək istəsə, ancaq Allahın sənin haqqında təqdir etdiyi zərəri verə bilərlər. Çünki artıq qədəri yazan qələm yazmaz, yazılar dəyişməyəcək şəkildə qətiləşmişdir".[56]** Bu hədis insana xeyrin də, zərərin də əzəli elmi ilə hər şeyi bilən Allahın təqdiriylə gəldiyini göstərir. Lakin ədalətli Allah əsla heç bir bəndəyə zərər diləməz. İnsanın qarşılaşdığı zərərlər öz əməlləri ucbatındandır. Bunu Rum surəsinin 60-cı ayəsi təsdiqləyir:

---

[54] **"Uluhiyyət"**, Allahın, kainatdakı təsərrüf (bir şeyi istədiyi şəkildə istifadə etmə haqqı, istifadə) və hakimiyyəti ilə hər şeyi Özünə ibadət və itaət etdirməsi deməkdir. Bunu da İlahlıq sifətləri ilə etməkdədir; bu sifətlər **elm, iradə, qüdrət, səmi', bəsar, kəlam və həyat** sifətləridir. Məsələn, Allah Təala mütləq və hüdudsuz bir qüdrət sahibi olduğu halda, Onun qarşısında rəqib bir qüdrət ola bilməz. Belə sonsuz bir qüdrətin qarşısında hər şey boyun əyib itaət etməlidir.

[55] Loğman surəsi, 16-cı ayə.

[56] "Mustədrak Əl-Hakim" (c.3, s.541).

**“İnsanların qazandıqları günahlar səbəbilə quruda və dənizdə fəsad ortaya çıxdı. Bu,** (Allahın) **onların etdikləri əməllərin** (cəzasının) **bir qismini daddırması üçün idi. Ola bilsin ki, onlar** (doğru yola) **qayıdarlar.”**

Burda bəndələrin qəlblərinin Rəbbinə bağlanıb Ona dua edib istəmənin vacibliyini vurğulamaq lazımdır. Bir hədisdə Peyğəmbərimiz belə buyurur: **“Allah Ondan istəməyənə qəzəblənir”.**[57] Qəlb ancaq Allaha bağlanar və ancaq Ona təvəkkül edər.

Hidayətə gəlincə isə, bu Allah-Təalanın əlindədir (qüdrətindədir). Allah-Təala dilədiyi kəsləri doğru yola yönəldər, dilədiyini isə azdırar. Müsəlman kişi və müsəlman qadın Allahdan qorxar və Vahid, Qüvvətli, Əziz olan Allaha yaxınlaşdıran və onun razılığına qazandıran əməlləri görməyə səy edər. Allaha itaət, kişi və qadını islami dəyərlərə, bütün əmr və qadağanlarda Rəbbinə və Rəsuluna itaət etməyə tam məsuliyyətli edir. Belə olarsa, Allah Rəsulunun ﷺ sözü həyata keçər: “**Allahın buyruqlarını qoru ki, Allah da səni qorusun. Allahın** (rizası) **hər işin başında** (qarşında) **olsun ki, Allahı qarşında tapasan”.**[58]

### *Qadınların səbri*

Əsri-səadətə nəzər salsaq, səhabə qadınların Allahın haq dini uğruna çəkdikləri əziyyət və səbr, bizim üçün bir mətanət timsalına çevrilir. Onların hər biri, qadınlar üçün örnək və səbr məktəbidir. Bu məktəbin təmsilçilərindən biri də, Huzeyyədir (r.a).

Məkkə dövründə Hüzeyyə (r.a) haq dinin çox insanların arasında yayılması üçün əlindən gəldiyi qədər səy göstərmişdir. O Məkkəlilərə məlum olana qədər İslamı Qüreyş qəbiləsinin qadınları arasında gizli şəkildə təbliğ edirdi. Sonra qəbilənin nüfuzlu adamları onu tutub həbs etdilər.

Bu zaman Hüzeyyənin (r.a) ərinin mənsub olduğu Daus qəbiləsinin bəzi üzvləri Məkkəni tərk etməyə hazırlaşırdılar. Qureyşlilər qəbilənin adamlarına Hüzeyyəni (r.a) təhvil verib bu şəkildə onu sürgünə göndərdilər.

Daus qəbiləsinin adamları amansız və cahil idilər. Onu yəhərsiz dəvəyə mindirib ac-susuz buraxdılar və hər cür məsxərəyə qoydular. Hüzeyyəni (r.a) elə möhkəm döydülər ki, o huşunu itirdi və ağır zərbələrin nəticədə eşitmə və görməsindən məhrum oldu. Lakin o imanından dönmədi. Bu insanlar Hüzeyyənin (r.a) səbrinə, həqiqi imanına şahid olduqları zaman, etdiklərinə peşman oldular və sonra İslamı qəbul etdilər.

---

[57] Ət-Tirmizi, “Dua”, 3085. Hədis həsəndir.
[58] “Mustədrak Əl-Hakim”, 3/541.

Peyğəmbərimiz ﷺ Mədinəyə hicrət edən zaman, Hüzeyyə (r.a) də hicrət etdi. Bəzi xəbərlərə görə, o Peyğəmbərə ﷺ Abdulqays oğulları qəbiləsinin nümayəndəsi kimi gəldi.[59]

Eyni zamanda, qadınların səbri bir fəzilətdir. Özü və ya övladı xəstələnərsə, qadının çəkdiyi cəfaya görə Allah qatında əcr və savabı var. Buna misal Ata bin Rabəhdən gələn rəvayətdir: İbn Abbas (r.a) mənə:

- Sənə Cənnətlik bir qadını göstərimmi? – deyə soruşdu.
- Bəli, göstər. İbn Abbas:
- Bu zənci qadın bir gün Peyğəmbərə ﷺ gəlib dedi:
- Məni sar'a (epilepsiya qıc olması) tutur və üstüm başım açılır. Sağalmağım üçün Allaha dua edin.

Allah Rəsulu ﷺ:

- **Əgər "səbr edərəm" deyərsən, sənə Cənnət vardır. Amma yenə də sən istəsən, sənə şəfa verməsi üçün Allaha dua edərəm -** buyurdu. Qadın:
- Mən (xəstəliyimə) səbr edərəm. Ancaq sar'a tutduğu vaxt üst-başımın açılmaması üçün dua edin - dedi.

Peyğəmbər ﷺ də ona dua etdi[60].

Digər bir hədisi-şərif Ümmü Sələmədən (r.a) rəvayət edilmişdir: "Allah Rəsulu ﷺ buyurur: **"Kimin malına və ya cisminə bir müsibət üz verərsə və onu gizlədib insanlara şikayət etməzsə, Allah onun günahlarının bağışlanmasını öhdəsinə götürər"[61].**

Qadınların səbr etməsi həqiqətən bir fəzilətdir. Aişədən (r.a) rəvayət olunduğuna görə, Allah Rəsulu ﷺ öz xanımlarına belə buyurardı: **"Həqiqətən mən narahatam ki, ölümümdən sonra sizə nə olacaq. Belə ki, məndən sonra sizə ancaq səbr edənlər səbrli davranacaqlar"[62].**

Qadın pis xasiyyətli olarsa, kişinin ona səbr etməsi də bir fəzilətdir. Çünki Allah-Təala səbr edənlərə axirətdə mükafat vəd edir. Qadının bir xasiyyəti onun xoşuna gəlmədikdə, digər xasiyyətindən razı qala bilər. Belə ki, Allah Rəsulu ﷺ buyurur: **"Bir mömin xanımına hirslənməsin! Pis xasiyyətiylə yanaşı, yaxşı xasiyyəti də vardır".[63]**

---

[59] İbn Həcər, "əl-İsabə", 4/447.
[60] Buxari, "Səhih", "Əl-Mərda", 5328.
[61] Ət-Təbərani İbn Abbasdan (r.a) rəvayət etmişdir. "Məcmə-uz zəvaid", 3/79.
[62] Əl-Hakim, "Mustədrak" və Ət-Tirmizi, "Əl-Mənəqib", 3749. Hədis həsən səhihdir.
[63] Müslim, "Səhih", "Qadınlara vəsiyyət", 1469.

### *Qadınların kişi xəstələrə baş çəkməsi*

İslam qadınların kişi xəstələrə baş çəkməsini təsəttürə riayət etmə, fitnədən təhlükəsiz olma və təkbaşına qalmama şərti ilə caiz görmüşdür. Belə ki, Ümmü Dərda (r.a) Ənsardan olan, məscid əhlindən bir kişiyə baş çəkmişdi. Aişədən (r.a) gələn rəvayətə görə, Allah Rəsulu ﷺ Mədinəyə gəldikdə, Əbu Bəkr (r.a) və Bilal (r.a) xəstə idilər. Onların yanına gələrək dedim: "Ey ata, özünü necə hiss edirsən? Ey Bilal, özünü necə hiss edirsən?"[64].

### *Qadının hicrəti*

Ümmü Sələmə (r.a) Peyğəmbərdən ﷺ qadınların hicrəti barədə bir Allah kəlamı varmı?" – soruşduqdan sonra bu ayə nazil olmuşdur**: "İstər kişi, istərsə də qadın olsun, Mən heç birinizin əməlini puça çıxarmaram"[65]**.

Bəs mühacir qadınların İslam dininə nə qədər sevgi ilə bağlanmışlar? Onların imtahan edilməsi barədə isə, Allah Azzə və Cəllənin bu kəlamı nazil olmuşdur: "**Ey iman gətirənlər! Mömin qadınlar hicrət edərək sizin tərəfinizə keçdiklərində dərhal onları sınağa çəkin! Allah onların imanını daha yaxşı bilir"[66].** Hicrətlərinin səbəbi nədir? Ərlərindən ayrılmaq üçünmü və ya başqa yerə köçmək yaxud dünyalıq əldə etmək üçünmü? Ona görə bu qadınlar Allah və Peyğəmbər naminə etdiklərinə dair and içərdilər.[67]

Yuxarıda qeyd olunan ayəyə görə, müsəlmanlara sığınan müsəlman bir qadın kafirlərə geri verilməyəcəkdi. Bu ayə həmin qadınların artıq kafirlərin nikahı altında olmadıqlarını bildirərək onların qaytarılmasının bağlanan Hüdeybiyyə müqaviləsinə daxil olmadığını xəbər verir.

"Əl-Mumtəhinə" surəsinin növbəti ayəsi bizə bu qadınların mehri barədə xəbər verir: **"Əgər zövcələrinizdən biri** (verdiyiniz mehri qaytarmadan) **sizi tərk edib kafirlərə qoşularsa və siz onlara qalib gəlsəniz, zövcələri getmiş kimsələrə** (onları tərk edən zövcələri üçün) **xərclədikləri** (mehr) **qədər** (qənimət) **verin. İman gətirdiyiniz Allahdan qorxun!"**

Əbul Həsən əl-Vahidi "Əsbəb-un nuzul" kitabında Hüdeybiyyə müqaviləsinin şərtlərindən birini bu rəvayətlə izah edir:

"Allah Rəsulu ﷺ Qureyşlə Hüdeybiyyədə belə razılığa gəldi: "Vəlisindən izn almadan özünə gələnləri qaytaracaq". Qadınlar hicrət etdikləri zaman, onların qaytarılmasına Allah razı olmadı. Gələn qadınlar imtahan ediləcəklər. İslama rəğbət göstərərək gəldikləri bilinənlər geri qaytarılmayacaq. Ancaq ayrıldıqları

---

[64] Buxari, "Səhih", "Əl-Mərda", 5330.
[65] Ali İmran 3/195.
[66] Mumtəhinə 60/10.
[67] Vahbə Əz-Zuheyli, "Əl-Munir təfsiri", 28/141.

ərlərinə mehirlərini verəcəklər. Çünki xanımlardan ayrı düşən müsəlmanlara mehirləri qaytarılmırdı."[68]

Burdan anlaşılır ki, nə kafir kişilər mömin qadınlara halaldır, nə də islamı qəbul edən müsəlman qadınlara əvvəlki kafir ərləri halaldır.

### *Qadının hədiyyəsi*

Ərin zövcəsinə hədiyyəsi və ya qadının qadına hədiyyəsi məqbuldur. Çünki Peyğəmbər ﷺ buyurur: "**Heç bir qonşu xanım, bir qoyun ayağı (dırnağı) olsa belə, qonşusuna verəcəyini kiçik görüb verməməzlik etməsin**" [69]. Hədiyyələrin qəbulu caiz olub hədiyyə edənə savab qazandırır. Eləcə də, müsəlman və kafir arasında hədiyyələşmək də caizdir və hədiyyəni qaytarmaq haramdır.

Övladlara hədiyyə etmədə ədaləti gözləmək vacibdir. Çünki, Allah Rəsulu ﷺ buyurur: **"Hədiyyədə övladlarınız arasında bərabərlik gözləyin"[70].**

İslam alimi Vahbət Əz-Zuheyli hədiyyə barədə belə yazır: **"Kişiyə malının, pulunun miqdarını xanımına bildirmək vacib deyil. Sirri yaymasından qorxub qadına sirr açma. Bir də qadına çox hədiyyə vermə. Çünki buna vərdiş edərsə, verilmədiyi zaman səbirsizlik göstərər".**[71]

[68] Əbul-Həsən əl-Vahidi, "Əsbəb-un nuzul", tərc. Necdet Çağıl, Necati Tetik, s. 420.
[69] Buxari, "Səhih", "Ədəb", 2240.
[70] Ət-Təbərani, "Əl-Mu'cəm-ul kəbir".
[71] "Əl-Fiqh-ul isləmiyyu va ədillətuhu", 7/343.

### *IV - Övladlığa götürmə və himayədarlıq*

Yetim uşaqların övladlığa götürülməsi ilə himayədarlığa alınması arasında fərqlər var:

1) Övladlığa götürmə (təbənni), bir şəxsin yetim uşağı oğulluğa və ya qızlığa götürüb öz adını (soyadını) ona verməsidir. Beləliklə, bu yetimlər üçün qəyyumun oğulları qardaş, qızları evlənmək qadağan olan bacı olur. Qəyyumun bütün qohumları isə, yetimin qohumlarına çevrilir.

Ərəblərin cahiliyyət dövrünə nəzər salsaq görərik ki, övladlığa götürənlərin adları yetim olan bəzi səhabələrin adlarına əlavə edilmişdir. Məsələn, Miqdad ibn əl-Əsvəd, atasının adının Amr olmasına baxmayaraq, onu böyüdən və övladlığa götürənin adı ilə İbn əl-Əsvəd adlandırılmışdır.

Tarixdən məlum olduğu kimi, İslamın ilk günlərindən Allah-Təala bunu qadağan edənə qədər belə davam etmişdir.

Ənəsdən (r.a) nəql olunur ki, Zeyd ibn Harisə zövcəsiylə boşandıqdan sonra, Zeynəbin gözləmə müddəti (iddə) qurtardıqda, Allah Rəsulu ﷺ Zeyd ibn Harisəni ona göndərdi: **"Zeynəbin yanına get və onunla evlənmək istədiyimi söylə".** Zeyd yola düşdü və Zeynəbin yanına gəldikdə onun xəmir hazırladığını gördü və dedi: "Ey Zeynəb, sevin, Allah Rəsulu ﷺ məni sənə elçilik üçün göndərdi". Zeynəb belə cavab verdi: "Rəbbimdən (özüm üçün) xeyir istəməyincə, bir şey etməyəcəyəm". Sonra namaz otağına getdi. Bundan sonra Allah Rəsulu ﷺ gəldi və onun yanına keçdi.[72]

Allah-Təala bu barədə aşağıdakı ayələri nazil etmişdir:

"(Ya Peyğəmbər!) **Bir zamanlar Allahın** (islam dininə yönəltməklə) **nemət verdiyi, sənin də yaxşılıq (köləlikdən azad etməklə) etdiyin kimsəyə** (Zeyd ibn Harisəyə)**: "Zövcəni** (Zeynəb bint Cəhşi) **saxla** (boşama) və **Allahdan qorx!" – deyirdin. Allahın üzə çıxaracağı şeyi** (Zeynəbin boşanacağı təqdirdə onu almağın haqda sənə nazil olan vəhyi) **insanlardan çəkinərək içində gizli saxlayardın** (onların Peyğəmbər oğulluğunun boşadığı övrətlə evlənir, – deyəcəklərindən)**. Halbuki qorxmağına ən çox layiq olan Allahdır. Zeyd onu boşadığı zaman Biz onu sənə nikahladıq ki, oğulluqları zövcələrini boşadıqları zaman** (möminlər o qadınlarla evlənmək istəyərlərsə) möminlərə **heç bir çətinlik** (günah) **olmasın!** (Bu işdən möminlərə heç bir günah gəlmədiyini bildirmək üçün belə bir övrətlə birinci səni evləndirib bütün müsəlmanlara nümunə etdik). **Allahın əmri yerinə yetirilmişdir!"** [73]

2) Uca Allah övladlığa götürməyi qadağan etmişdir, çünki belə etdikdə əmr edilən ailə əlaqələri itir.

---

[72] Muslim, "Səhih", 1428.
[73] Əhzab 33/37.

Əbu Zərrdən (r.a) rəvayət edildiyinə görə, Peyğəmbər ﷺ belə buyurub: **“Atası olmayan birini öz oğlu olduğunu iddia edən hər bir kəs,** (əslində) **bunun** (belə olmadığını) **bildiyi halda, mütləq şəkildə kafirlərin əməlini edən bir şəxs olur**.”[74]

**“Qohumluq əlaqəsi olmayan bir xalqa mənsub olduğunu elan edən kəs isə, odda öz yerini almağa hazırlaşsın”**.[75]

Özünü atasından başqasının oğlu adlandıran bir insan, özü üçün Allahın haram etdiyini mübah edir və Onun icazə verdiyi şeyi isə haram edir.

Övladlığa götürülən yetim oğlanın övladlığa götürənin qızı ilə evlənməsinə qadağan edilməsi də, caiz olanın qadağanın edilməsi deməkdir. Çünki Uca Allah belə evliliyi qadağan etməmişdir. Lakin yetimin övladlığa götürən valideynin mirasından bir pay alması, qadağan olunanı caiz etməkdir. Çünki yalnız doğma oğullar miras almaq hüququna malikdirlər.

Bütün bunlar, övladlığa götürülmüş uşaq ilə övladlığa götürən valideynin övladları arasında nifrət və qəzəbə səbəb ola bilər. Çünki onlar yetimə haqsız olaraq veriləcək bəzi haqqlarından məhrum olurlar və qəlblərində onun mirasdan paya haqqı olmadığını başa düşürlər.

Yetimlərin qəyyumluğuna gəldikdə, bu, bir insanın yetimi evinə götürməsi və ya evinin xaricində onu himayə etməsidir. Lakin qəyyum bu uşağı oğlu kimi özünə mənsub etmir. Beləliklə, övladlığa götürmədə olduğu kimi, özünə caiz olan işi qadağan etmir və qadağan olunanı isə caiz etmir. Qəyyum olan kəs, himayə etdiyi uşağa səxavətlə yanaşır, qayğısına qalır və Uca Allahın bəxş etdiyi mərhəmət və nemətləriylə onu təmin edir. Qəyyum, övladlığa götürən valideyn kimi deyil. Bu ikisi arasında fərq var və İslam yetimlərin qəyyumu olmağa və onları himayəyə almağa təşviq edir.

Uca Allah belə buyurur: **“**(Ya Rəsulum!) **Səndən yetimlər haqqında da soruşurlar. De ki: "Onlar üçün** (güzəranlarını) **yaxşılaşdırmaq daha xeyirlidir** (nəcib əməldir). **Əgər onlarla birlikdə yaşayırsınızsa, onlar sizin qardaşlarınızdır". Allah fitnə-fəsad törədəni** yaxşılıq **edəndən ayırd edir. Əgər Allah istəsəydi, əlbəttə, sizi əziyyətə salardı. Həqiqətən, Allah yenilməz qüvvət və hikmət sahibidir!**”[76]

Allah Rəsulu ﷺ yetimlərə qəyyumluğu və himayədarlığı Cənnətdə daimi qonşuluğunun səbəbi etmişdir. Səhl ibn Səadın rəvayətinə görə, Allah Rəsulu ﷺ belə buyurdu: *“***Mən və cənnətdəki yetimin qəyyumu, bax belə bir-birimizə yaxın olacağıq”. Sonra şəhadət və orta barmaqlarını bir-birindən bir az aralayaraq işarə etdi.”**[77]

Ancaq qeyd etmək lazımdır ki, bu yetimlər yetkinlik yaşına çatdıqda, onları himayədarın qadınlarından və qızlarından uzaqlaşdırmaq lazımdır.

---

[74] Yəni inkar edənlərin əməlini etdi, amma kafir olmadı.
[75] Buxari, “Səhih”, 3317; Muslim, “Səhih”, 61.
[76] Bəqərə 2/220.
[77] Buxari, “Səhih”, 4998.

Qəyyumlar və himayədarlar bir tərəfdən xeyirli bir iş görüb, digər tərəfdən onu korlamasınlar. Habelə, yadda saxlamaq lazımdır ki, yetim bir qız yetkinlik yaşına çatmadan da gözəlləşə bilər. Bu səbəbdən də qəyyum öz oğullarına nəzarət etməlidir ki, onlar yetim qızlarla qadağan olunan bir iş görməsinlər. Çünki bu, düzəldilməsi çətin olan pis bir işə səbəb ola bilər.

Bu fürsətdən istifadə edib qardaş və bacılarımızı yetimlərin qəyyumu olmağa təşviq etmək istərdik. Təəssüf ki, Allah-Təala hər insana yetim və kasıblarla qarşı saleh əməllər görmək istəyini vermir. Çox az insanda belə olur. Bu, xüsusilə, Suriyadan, Fələstindən, Çin və digər ölkələrdən olan inanclı qardaşlarımıza aiddir. Onlar çox çətinliklər və əzablar yaşayıblar. Uca Allahdan onlara kömək etməsini, çətinliklərdən və bəlalardan qurtarmasını diləyirik.[78]

Ən doğrusunu Allah bilir.

[78]Veb səhifə "İslam: Sual və Cavab"

## *V - Qadınların vətəndaş haqları*

### *Qadının evdən çıxma izni*

İslamda qadının ərinə itaət etməsi vacib haqlardan biridir. Digər haqqı isə, öz mehrini alan vaxtdan evində qalmasıdır. Həmçinin, analıq və zövcəlik haqlarına səhlənkar yanaşmayıb, dinimizin əmrlərinə uyaraq, özünü evlilik və ev işlərinə həsr etməsidir və övladlarını böyütməsidir.

Bəs kişi hansı hallarda zövcəsinə evdən çıxmağa qadağanlar qoya bilər?

Kişinin zövcəsinə üzürlü səbəb olmadan evdən çıxmasına və məscidə getməsinə qadağan etmə haqqı var. Buna misal olaraq İbn Ömərdən (r.a) nəql olunan rəvayəti gətirmək olar. Peyğəmbərin ﷺ hüzuruna bir qadın gələrək dedi:

- Ey Allahın Rəsulu, zövcənin əri üzərində haqqı nədir?" Peyğəmbər ﷺ isə:
- **"Qadının üzərində ərin haqqı, ancaq onun izni ilə evdən çıxmasıdır. Əgər çıxarsa, Allah, rəhman və qəzəb mələkləri tövbə edənə və ya evə qayıdana kimi, o qadına lənət edər" -** buyurdu**.** Qadın:
- Ey Allahın Rəsulu, kişi zalım və asi olsa, necə?" – deyə soruşdu. Allah Rəsulu ﷺ belə buyurdu:
- **"Zalım və asi olsa belə"**[79].

Hədisdən gördüyümüz kimi, ərin haqqı vacibdir və qadının lüzumsuz səbəblərə görə bu haqqı tərk etməsi caiz deyil.[80]

Eyni zamanda, qadının ərinin izni olmadan evindən çıxması, onun nəfəqə haqqını düşürür, çünki ər evində qalması vacibdir. Qadın bir üzürlü səbəb olmadan evdən çıxarsa, naşizə[81] sayılır.

Lakin bəzi hallarda qadın evdə iznsiz çıxa bilər:

1) Qadının yanında məhrəm bir qohumuğu olduğu halda fərz həccə gedə bilər. Çünki burda ərin izni olub olmaması məsələni dəyişdirmir. Çünki onun haqqı, fərz əməlin haqqını əngəlləyə bilməz.
2) Qadın, başqalarında qalan haq və borclarını gedib ala bilər.
3) Ər elm əhli olmadığı və zövcəsinə dini məsələlərdə məsləhət verə bilmədiyi halda, qadının onları öyrənmək və fətva almaq üçün elm məclislərində iştirak edə bilər və bilmədiklərini soruşa bilər. Ərin haqqı yoxdur ki, buna görə onun evdən çıxmasına qadağan etsin. Lakin, kişi

---

[79] "Məcmu-uz zəvaid", 4/564.

[80] Vahbə əz-Zuheyli, "Əl-Fiqh-ul isləmiyyu va ədillətuhu", 7/336.

**Şafii** məzhəbinə görə isə, ərin izni olmadan qadın evdən çıxarsa və buna bir etiraz etməyəcəyinə əminliyi varsa, o zaman bu hal itaətsizlik sayılmayacaq. "Haşiyətu İanət-ut talibin" kitabının müəllifi belə yazır: "Ərin izni olmadan qadının evdən çıxması və ya buna böyük ehtimala görə razı olmaması, ona itaətsizlik sayılır. Lakin qadının evdən çıxması, ərin izniylə və ya yəqin ehtimallı icazəylə baş verərsə, bu ərə itaətsizlik sayılmayacaq". "Haşiyətu İanət-ut talibin", 4/141-142..

[81] Naşizə, zövcünü qəzəbləndirərək ona üsyan edən və haqqı olmadan evdən çıxan qadındır.

elm əhli olarsa, xanımına bilmədiklərini öyrətmək və məsləhət vermək haqqı var.

4) Ər zövcəsinə ən az həftədə bir dəfə valideynlərinə, ildə bir dəfə isə qardaş, bacı, xala, dayı, əmi və bibi kimi yaxın qohumlarına baş çəkməsinə qadağan edə bilməz. Çünki "sileyi-rahmi" (qohumluq əlaqələrini) kəsmək caiz deyil. Lakin ərin izni olmadan qadın başqa yerdə gecələyə bilməz.

Yaxın qohumlara baş çəkməkdə isə, aşağıdakı ölçülər təyin edilmişdir:

1) Eyni şəhər və rayonlarda yaşayanları həftədə bir dəfə;
2) Səfər məsafəsinə (90 km) daha yaxın olan yerlərdə yaşayanları ayda bir dəfə;
3) Bu məsafədən uzaq yaşayanları isə, ildə bir dəfə ziyarət etmək olar.

Müasir rabitə əlaqələrini yəni telefon, mesajlaşma və video görüntülü ünsiyyətləri nəzərə alsaq, bu əlaqələri daha asan yolla qurmaq mümkündür.[82]

Bundan başqa, ata ağır xəstə olub qulluğa ehtiyacı varsa, əri də qadına bu öhdəliyi götürməyə mane olarsa, atanın müsəlman və ya kafir olmasından asılı olmayaraq, qadın ona itaət etməməlidir.

Eləcə də, ər, qaynatası və qaynanasının gecə qalmadan, həftədə bir dəfə gəlmələrinə, həm də zövcəsinin başqa nikahdan olan uşaqlarını gedib görməyinə qadağan edə bilməz.[83]

Qadının evdə qalması, onun ev həbsində olması demək deyil. Belə ki, Allah Rəsulu ﷺ buyurur: **"Həqiqətən qadın övrətdir, evdən çıxanda şeytan nəzərləri ona tərəf yönəldir. Qadının evində qalması, Rəbbinin rəhmətinə daha yaxındır"[84].** Bu hədis bizə göstərir ki, qadın evində daha çox vaxt keçirməklə Uca Allahın rəhmətin nail ola bilər. Eləcə də, hədisdə qadına örtünmənin vacib olduğuna işarət var. Çünki şeytan övrət yerləri açıq olan qadın vasitəsilə vəsvəsə verib kişilərin təhrik olmasına və hətta fitnələrin yol açmasına səbəb olur.[85]

Evdən çıxarkən qadının təsəttürə riayət etməsi, üzündən və əllərindən başqa bədənin heç bir yerinin görünməməsi vacibdir. Bəzi övrət yerlərini açıq qoyub çıxdığı halda isə, qadın fitnəyə və şəhvətli nəzərlərə məruz qala bilər. Çünki, Allah Azzə və Cəllə buyurur: **"...Əvvəlki cahiliyyə dövründə olduğu kimi açıq-saçıq geyinməyin".[86]** Yəni nazlı yerişlə, cəlb edici hərəkətlərlə, eləcə də, şəffaf, incə, cəzb edici və rəngarəng paltar geyinməklə, vurduğu ətrin qoxusu uzağa və ya yaxına yayılacaq dərəcədə açılıb saçılmayın.

---

[82] **Şafiilərə** görə, valideynləri görmək qadağan edildiyi halda, qohum ziyarəti də, qadağan edilir.
[83] "əl-Fətəvayi-Hindiyyə", 1/556; Abdulkərim Zəydən,"Əl-Mufəssəl fi əhkəm-il mər'əti val-bəyt", 7/295; Döndürən, "Dəlilləriylə İslam Hüququ", 327.
[84] Tirmizi, "Nigah", 1183.
[85] Vahbə əz-Zuheyli, "Əl-Fiqh-ul isləmiyyu va ədillətuhu", 7/337.
[86] Əhzab surəsi 33/33.

Həmçinin, Allah Rəsulu ﷺ buyurur: **“Hər hansı bir qadın ətir vuraraq** (evindən) **çıxar, ətrinin qoxusunu hiss edib özünə nəzəri cəlb etməsi üçün bir qövmün yanından keçərsə, o qadın mənən zinakardır”**[87].

Rəbbim hər bir qadına evdən çıxarkən öz haqlarına layiqincə, Allah-Təalanın və Peyğəmbərimizin ﷺ buyurduğu kimi əməl etməyi nəsib etsin!

### *Qadın və iş*

Hər qadının özünün fitrətinə, qabiliyyətinə uyğun işlərdə işləmək haqqı var. Əsas odur ki, iş yeri və mühiti İslami qaydalara uyğun olsun.

Peyğəmbər ﷺ dövrünə nəzər salsaq, qadınların müxtəlif işlərdə məşğul olduğunu görərik. Allah Rəsulunun ﷺ zövcəsi Xədicə anamızın (r.a) ticarət işləriylə məşğul olması hər kəsə məlumdur. Bundan başqa, Zeynəbin (r.a) dəri dabbaqlayıb tikməsi və öz qazancından sədəqə verməsini hədislərdən öyrənirik. Hətta Aişə anamız (r.a) onun barəsində belə demişdir: “Aramızda ən səxavətli olan Zeynəbdir. Çünki o, işləyir və qazancından sədəqə verir”.[88]

Qadının işləməsi, kişini ona nəfəqə ödəmə haqqından azad edir, demək deyil. Lakin, bu məsələdə nəfəqə haqqı vəziyyətə görə dəyişir.

***Nəfəqə haqqını itirmədiyi hal:***

Əgər zövcə gecə-gündüz evdən kənarda, həkim, müəllimə, hüquqşünas, tibb bacısı və s. işləyib və ər də ona işə getməyə icazə verirsə, bu, onu qadını nəfəqəylə təmin etmək haqqından uzaqlaşdırmır. Çünki ərin öz haqqından imtina etməsi, onu öhdəlikdən azad etmir.

***Nəfəqə haqqını itirdiyi hallar:***

1) Ər zövcəsinin işindən razı olmayıb işləməsini qadağan edirsə və o da işləməyə davam edərsə, ərinin hüquqlarını tam yerinə yetirmədiyi üçün nəfəqəylə təmin olunmaq haqqını itirir. Lakin işi evdə olub, bu, onu yormaz və gözəlliyini əlindən almazsa, onda eybi yoxdur. Amma qadın onun əmrinə zidd hərəkət etsə, nəfəqə haqqından məhrum olar. Bu səbəblə də, ər zövcəsini ədəbləndirməlidir.
2) Ər əvvəlcə zövcənin işləməsinə razı olarsa, sonra fikrini dəyişib qadağan edərsə, lakin qadın işləməyə davam edərsə, o, nəfəqə haqqını itirir. Çünki qadının evdən çıxması, itaətsizlik olub onu nəfəqə haqqından məhrum edir.

İslam alimi Şeyx Muhamməd Əbu Zuhrat (ö/1974) işləyən qadınlar barədə görüşü budur:

**“Bu məsələdə peşə sahibi qadınların nəfəqəsi barədə ixtilaf var.**

**Ümumi mülahizədən belə nəticəyə gələ bilərik ki, qadın qızlarının dərs təlimi və bunun kimi fərzi-kifayə işlər üçün çıxarsa, ərin izninə ehtiyac**

---

[87] Tirmizi, “Ədəb”, 2937.

[88] Müslim, “Kitəbu Fəzail-us Sahabə”, “Zeynəbin (r.a) fəzilət babı”, 7/144; İbn Hacər, “Fəth-ul Bari”, 4/29,30.

**yoxdur. Amma fərzi-kifayə olmayan işlər üçün çıxdıqda, onun izninə ehtiyacı var**.

**Nəfəqə məsələsinə gəlincə isə, fiqh kitablarında qeyd olunur ki, qadın ancaq ərinin izniylə bir peşəylə məşğul olduqda (işlədikdə), ona nəfəqə vacib olur. Evdən çıxması ilə nəfəqə arasında fərq ondadır ki, nəfəqə, qadının evdə qalmasının kompensasiyasıdır. Lakin qadın əsassız yerə evdən çıxdıqda, nəfəqə haqqı gerçəkləşmir.**

**Amma günah və ya itaət məqsədiylə evdən çıxarsa, bu başqa məsələdir. Lakin elə də olur ki, bəzi işləyən qadınları ərləri zorla saxlayıb çıxmasına qadağan edirlər. Onun işi fərzi-kifayi işlərdəndirsə, ərin buna haqqı yoxdur. Çünki bu halda qadına qadağan etməsi, günahdır. Yaradana itaətsizlikdə məxluqata itaət yoxdur. Evdən çıxdığı halda, açılıb-saçılmadan, bəzənmədən çıxmalıdır".[89]**

"Fəth-ul Qadir" kitabının müəllifi demişdir: **"Yalnız kişilərin nəzərlərini və diqqətini cəlb etmək üçün geyinib xarici görünüşünü dəyişdirməmək şərtiylə, biz qadının evdən çıxmasını caiz sayırıq."**[90]. Allah-Təala buyurur: **"...Əvvəlki cahiliyyə dövründə olduğu kimi açıq-saçıq geyinməyin"[91].**

Bir qadının işləmə şərtlərini bu cür sadalaya bilərik:

1) Təsəttürə riayət etməsi;
2) Qarşı cinsə qarışmaqdan və xəlvətdə qalmaqdan çəkinməsi;
3) Ərin və vəlisinin izni;
4) İslama uyğun və fitrətinə münasib bir işdə işləməsi;
5) Ev işlərinə və övladlarına qarşı səhlənkar yanaşmaması.

Bu 5 şərtə əməl edən qadının işləməsi münasibdir. Lakin qadın evdə qalaraq özünü yıpratmadan, yormadan bir işlə məşğul olmasıdır. Belə olan halda, o evinə, ərinə və övladlarına da vaxt ayırar və səhlənkarlıq etməz. Ən əsası da, hədisdə buyrulduğu kimi, Uca Allahın rəhmətindən məhrum qalmaz.

---

[89] Muhamməd Əbu Zuhrat, "Əl-Əhval-uş şəxsiyyətu", s.278-279.
[90] «Fəth-ul qadir", 3/336.
[91] Əhzab 33/33.

# Üçüncü fəsil

# Hənəfi məzhəbi və İmam Əbu Hənifənin (r) həyatı

- **Hənəfi məzhəbinin meydana gəlmə tarixi**
- **İmami-Əzəm Əbu Hənifənin həyatı**
- **Fiqhi terminlər**

# *I - Hənəfi məzhəbinin meydana gəlmə tarixi*

Bildiyimiz kimi, Hənəfi məzhəbinin yarandığı yer Kufə şəhəri olmuşdur. Kufə şəhəri qədim zamanlarda islami elmlərin mərkəzi olmaqla seçilən bir şəhər idi. Yeddi mütəvatir qiraət imamlarından üçünün, Asim ibn Əbun-Nəcud, Həmzə ibn Həbib və Əli ibn Həmzə əl-Kisainin Kufə imamları olması, bu şəhərin Qurani-Kərim elmlərində nə qədər inkişaf etdiyinin ən bariz nümunəsidir.

O dövrdərdə hənəfilər barədə yanlış bir fikir formalaşmışdır ki, hənəfilərin "əhli-rəy" adlanmasının səbəbi, İraqın, xüsusilə Kufənin hədisdən yoxsul olması idi. Deyilənə görə, İraq Hicaza nisbətən hədislərin az olduğu bir diyar idi.

İmam Əhməd bin Abdullah əl-İcli, təkcə Kufə şəhərinə min beş yüz səhabə gəldiyini qeyd edir.[92] İmam əl-Kövsəri, əl-İclinin bu sözünü qeyd etdikdən sonra belə deyir: "Onların yetmişə yaxını Bədr müharibəsində iştirak etmiş səhabələrdir. Üstəlik bu say, Kufədə yaşayıb elm yaydıqdan sonra başqa şəhərlərə köçənlərdən əlavə, sırf Kufədə qalan səhabələrin sayıdır".[93]

Təbii ki, bu səhabələr – yaxud əksəriyyəti- Peyğəmbərimizdən eşidib gördüklərini rəvayət edirdilər. Bu isə hələ onların dövründə Kufənin hədislə dolu bir diyar olduğunu göstərir.

Muhamməd ibn Sirinin belə dediyi rəvayət olunur: "Deyrul-Cəmacim döyüşündən əvvəl Kufəyə getmişdim. Orada dörd min nəfər hədislə məşğul idi".

Hənəfilərin "əhli-rəy" adlanmasına gəlincə, əvvəlcə "rəy" sözünün elmi bir istilah (termin) olaraq nə mənaya gəldiyini bilmək lazımdır. Alimlərin istifadə etdiyi istilahda "rəy" sözü "fiqh" sözünün sinonimidir və əslində təkcə Hənəfi məzhəbinin alimlərinə xas deyil. Bu səbəbdən hicri III əsrdə yaşamış İbn Quteybə əd-Dinəvəri, qələmə aldığı "əl-Məarif" kitabında "Rəy əshabı" adı altında səkkiz nəfər alimin adını qeyd edir: İbn Əbu Leyla, Əbu Hənifə, Rabiə ibn Fərrux, Zufər ibn əl-Huzeyl, əl-Əvzəi (Şam alimi olub), Sufyan əs-Sövri, Malik ibn Ənəs[94], Əbu Yusif, Məhəmməd ibn əl-Həsən əş-Şeybani.[95]

Hənəfilərin "rəy əhli" olaraq daha çox yad edilməsi isə, əl-Kövsərinin də qeyd etdiyi kimi, onların ictihad işində daha mahir olmasından qaynaqlanır.

### *Məzhəbin təşəkkülünə təsir edən şəxslər*

Hənəfi məzhəbinin təşəkkülündə rolu olan fəqihlərdən iki başlıq altında danışmaq mümkündür. Səhabə dövründən Əbu Hənifəyə qədər gəlmiş elmi silsilə və Əbu Hənifənin tələbələri.

---

[92] Əl-İcli, "Mərifətus-siqat", 2/448.
[93] Əl-Kövsəri, "Fiqh əhlil-İraq və hədisuhum", 42.
[94] Malik bin Ənəs Hicazda qurulmuş Maliki məzhəbinin imamıdır. Rabiə onun Mədinəli şeyxidir.
[95] İbn Quteybə, "əl-Məarif", 248-251.

***İbn Məsud və Əli (r.a).***

Əmirəlmöminin Ömər ibn əl-Xəttabın (r.a) fərmanıyla hicrətin 17-ci ilində təməli atılan Kufə şəhərində təlim-tərbiyə vəzifəsi səhabələrinin fəqihlərindən Abdullah ibn Məsuda həvalə edilmişdir. İbn Məsud, elmi bilavasitə Peyğəmbərimizin şahidliyi ilə təzkiyə edilmiş bir fəqihdir: **“Qurani-Kərimi nazil olduğu kimi düzgün oxumaq istəyən qoy İbn Məsudun oxuduğu kimi oxusun.”**[96] **“Qurani-Kərimi dörd nəfərdən öyrənin: Abdullah ibn Məsud, Əbu Huzeyfənin azadlısı Salim, Ubeyy ibn Kab və Muaz ibn Cəbəldən”.**[97]

İbn Məsud, ona tapşırılan bu vəzifənin öhdəsindən layiqincə gəlmiş və Kufə şəhərini alimlərlə doldurmuşdur. Hətta Əmirəlmöminin Əli ibn Əbu Talib (r.a) Kufəyə köçdükdə buna şahid olmuş və “İbn Məsudun əshabı bu şəhərin nurlarıdır.” – demişdir.[98]

***Alqamə ibn Qeys.*** İbn Məsud və Əlidən sonra Kufə fiqhinin təmsilçisi, bu tələbələr arasında ən güclüsü, ümmətin rabbani imamı Alqamə bin Qeys ən-Nəxai idi. Onun hətta davranışı və əxlaqı da İbn Məsuda bənzəyirdi. Həmçinin, o, Siffin döyüşündə Əlinin ordusunda yer almışdır.

Alqamə ibn Qeys, İbn Məsud və Əlidən başqa Ömər,Osman, Əbud-Dərda, Ammar ibn Yasir və Aişə kimi (r.a) böyük səhabələrin elmindən də faydalanmışdır. Alqamə ibn Qeysdən fətva soruşan səhabələr belə var idi.

***İbrahim ən-Nəxai.*** Alqamə ibn Qeysdən sonra Kufə fiqhinin təmsilçisi, Alqamənin ən güclü tələbəsi İbrahim ən-Nəxai oldu. O İraq fiqhində, xüsusilə İmam Əbu Hənifənin elmi həyatında olduqca vacib simalardandır. Imam əl-Kövsərinin də qeyd etdiyi kimi: “Əbu Hənifə mənhəc olaraq Əli və İbn Məsudun (r.a) tələbələrinin və bu tələbələrdən dərs almış İraq alimlərinin, xüsusilə İbrahim ən-Nəxainin yolunu izləmişdir.”[99]

***Həmmad ibn Əbu Süleyman.*** Əbu Hənifənin müəllimi olan Həmmad, İbrahimin tələbələri arasında fiqhinin gücü ilə seçilirdi. Bu səbəbdən Muğira ibn Miqsəm, İbrahim ən-Nəxaidən: “Sən vəfat etdikdən sonra kimdən elm alaq?”-deyə soruşduğu zaman İbrahim: “Həmmaddan”-demişdi.[100]

Şeyx İbrahimin zamanında artıq Həmmad ibn Əbu Süleymanın fətva məclisləri var idi.

Həm əl-İclinin, həm də əz-Zəhəbinin dediyi kimi, Həmmad İbrahim ən-Nəxainin tələbələri arasında fiqhi ən güclü olan birisidir.[101]

---

[96] Ət-Tahavi, “Şərh muşkilil-əsar”, 14/232.
[97] Əl-Buxari, “Səhihul-Buxari”, 37581.
[98] İbn Sad, “Ət-Tabaqatul-kubra”, 8/132.
[99] Əl-Kövsəri, “Husnut-təqadi fi siratil-imam Əbi Yusif əl-qadi”, 26.
[100] İbn Sad, “ət-Təbaqatul-kəbir”, 8/452.
[101] Əl-İcli, “Mərifətus-siqat”, 1/320, əz-Zəhəbi, “Siyər əlamun-nubələ”, 5/236.

Bu şəkildə Kufə fiqhi ən güclü fəqihdən ən güclü fəqihə keçərək səhabədən İmam Əbu Hənifəyə qədər gəlmişdir. Əz-Zəhəbinin də qeyd etdiyi kimi: “Kufə əhlinin ən güclü fəqihi Əli və İbn Məsuddur, onların ən güclü fəqih tələbəsi Alqamədir, onun ən güclü fəqih tələbəsi İbrahimdir, onun ən güclü fəqih tələbəsi Həmmaddır, Həmmadın ən güclü fəqih tələbəsi isə Əbu Hənifədir.”[102]

### *İmam Əbu Hənifənin tələbələri*

Qazı Hüseyn ibn Əli əs-Sayməri Imam Əbu Hənifənin nəvəsi vasitəsilə İmamın öz tələbələrini belə vəsf etdiyini rəvayət edir: “(Yaxın) tələbələrim otuz altı nəfərdir, onlardan iyirmi səkkiz nəfəri qazi olmağa, altı nəfəri müfti olmağa layiqdir. Iki nəfər isə - Əbu Yusiflə Zufəri qəsd edir – qazi və müftilər yetişdirməyə qadirdir.”[103]

Qazılıq vəzifəsini icra edən tələbələrindən bəziləri aşağıdakılardır:

1.Əbu Yusif, Yaqub ibn İbrahim əl-Ənsari. Ilk dəfə qazıl-quzat (qazılar qazısı, baş qazı) rütbəsini icra edən imam.

2. Məhəmməd ibn əl-Həsən əş-Şeybani. Əvvəlcə ər-Raqqa qazisi olmuş, daha sonra qazıl-quzat vəzifəsini icra etmişdir.

3.Həsən ibn Ziyad əl-Lului. Hafs ibn Ğiyasın vəfatından sonra qısa müddət Kufədə qazi olmuşdur.

4.Əbu Muti, əl-Hakəm ibn Abdullah əl-Bəlxi. On altı il Bəlx qazisi vəzifəsində işləmişdir.

5. Əbu Amr, Əsəd ibn Amr əl-Bəcəli, Vasit və Bağdad qazılığı vəzifəsini icra etmişdir.

6.Yəhya ibn Zəkəriyya ibn Əbu Zaidə, Mədinədə qazı işləmişdir.

7. Afiyə ibn Yezid əl-Əvdi. Bağdadda qazı olmuşdur.

8. İbn Məsudun nəticəsi əl-Qasim ibn Mən. Kufə qazisi olmuşdur.

9. Əbu Ömər hafs ibn Ğiyas ən-Nəxai. Bağdad və Kufədə qazılıq vəzifəsini icra etmişdir.

10. Əli ibn Mushir. Mosul qazisi olmuşdur.

Əbu Hənifənin tələbələrinin, xüsusilə dörd məşhur tələbəsi Əbu Yusif, Zufər, Məhəmməd və Həsənin tərcümeyi-hallarına nəzər salan hər kəs, onların İraqın nəhəng fiqhi simaları olduğunu danmaz.

### *Hənəfi məzhəbinin yazılma şəkli*

Hənəfi məzhəbinin yazılması dedikdə, az əvvəl adları sadalanan imamlar arasında ən çox ağla gələn İmam Məhəmməd ibn əl-Həsən əş-Şeybanidir. İmam Məhəmməd məzhəbdə ən mötəbər qaynaqlar külliyatı sayılan “Zahurur-rivayə”

---

[102] Əz-Zəhəbi, “Siyər əlamun-nubəla”, 5/236.
[103] Əs-Sayməri, “Əxbar Əbu Hənifə və əshabih”, 158.

əsərlərinin müəllifidir. Bu külliyata beş əsər daxildir: "əl-Əsl", "əl-Cəmiul-kəbir", "əl-Cəmius-sağir", "əs-Siyərul-kəbir" və "əz-Ziyadət" əsərləri.[104]

Lakin bu, İmam Məhəmmədin məzhəbi ilk qələmə alan şəxs olması demək deyil. Hələ İmam Əbu Hənifə həyatda ikən onun başçılığı altında, əl-Kövsərinin təbiriylə "tələbələrdən ibarət elmi heyət"məzhəbi qələmə alma vəzifəsini icra edirdi. İbn Əbul-Avvam sənədi ilə Muğira ibn Həmzənin belə dediyini rəvayət edir: "Əbu Hənifəylə birgə kitab yazan tələbələri qırx nəfər idi, hamısı da böyüklərin böyüyü."[105]

İmam Əbu Hənifənin vəfatından sonra da bu elmi şuranın müctəhid fərdlərinin görüşləri, Hənəfi məzhəbinin görüşü olaraq qəbul edilmişdir. Bu səbəbdən məzhəb kitablarında imamdan başqa, məzhəbin Ənu Hənifəylə birgə qurucularından sayılan dörd imamın görüşləri də qeyd edilir: Qazı Əbu Yusif, Məhəmməd ibn əl-Həsən əş-Şeybani, Zufər ibn əl-Huzeyl və Həsən ibn Ziyad.

---

[104] Bəzi qaynaqlarda altıncı kitab kimi "əs-Siyərus-sağir" kitabı qeyd edilsə də, bu əsər imamın ayrıca qələmə aldığı bir əsər deyil. Ən doğrusunu Allah bilir.

[105] İbn Əbul-Avvam, "Fədail Əbi Hənifə və əxbaruh və mənaqibuh", 342.

## *II - İmami-Əzəm Əbu Hənifənin həyatı*

Əsl adı Numan bin Sabit olan və İmami-Əzəm ləqəbiylə tanınan Əbu Hənifə, hicri 80-ci (miladi 699) ildə Kufədə doğulmuşdur. Əvvəl burada Qurani-Kərimi əzbərlədi. Ərəb dilinin o dövrdə hələ qurulan sərf və nəhviylə şeir və ədəbiyyatını öyrəndi. Kufə, Bəsrə və bütün İraqın böyük ustadlarından hədis və fiqh dərsləri aldı. O zamanlar o, Kufə və Bəsrədə inkişaf edən cədəl və İslamın dini fəlsəfəsi olan "kəlam" elmini öyrənmişdir. Kufənin imamlarından Əbu Amr Amir Şə'bi ilə yaxın münasibəti vardı. Hətta elm yoluna girməyində bu alimin böyük təsiri olmuşdur. Mənbələrə görə, 16 yaşında ikən atası ilə birlikdə Hicazda olmuş və 714-ci ildə Məkkədə, Kəbənin hərəmində hədis ravilərinin dərs halqalarında hədis dinləmişdir. Əbu Hənifə bu səyahətində Ata bin Əbu Rəbah və Nafi kimi tabiinlərlə ünsiyyətdə olmuş və onlardan da hədis dinləmişdir. Eləcə də onun İraqda ikən tabiindən 93 şəxslə görüşdüyü rəvayət edilmişdir ki, bu hal Əbu Hənifənin tabiinin kiçiklərindən və təbəi-tabeinin böyüklərindən olduğunu göstərir.

20 yaşında ikən Əbu Hənifə, İraqın məşhur fəqihi Hammad bin Süleymanın Kufə məscidindəki dərslərinə davam etdi. Eyni zamanda, oranın başqa alim və fəqih mühəddislərindən dərs dinlədi. İmam Əzəmin İmam Cəfər əs-Sadiq (ə.s), Ömər (r.a), Əli (r.a), İbn Məsud (r.a) və İbn Abbasın (r.a) qollarına mənsub elmli şəxslərdən və bundan əlavə daha 4000-ə yaxın din alimlərindən hədis dinlədiyi də rəvayət edilmişdir. Əbu Hənifə ustadı Hammad olmadığı vaxtlarda onun tərəfindən vəkalət alardı. Ustadının dərslərinə 10 ilə yaxın davam etdikdən sonra ayrı bir tədris halqası qurmağı düşünmüşdür, lakin müəllimi üçün etdiyi iki aylıq vəkillik dövründə verdiyi 60 fətvadan iyirmisinə ustadı tərəfindən düzəliş verildiyini görərək, Hammadın vəfatına qədər onun dərs halqasından ayrılmamışdır.

Hammad bin Süleyman hicri 120-ci ildə vəfat etdiyi zaman qırx yaşında olan Əbu Hənifə ustadının başqa fəal tələbələrinin və dostlarının təkidli xahişlərilə ondan boşalan yerə keçmiş və dərsləri davam etdirməyə başlamışdır.

Əbu Yusif Yaqub bin İbrahim əl-Ənsari, Züfər bin əl-Hüzeyl əl-Ənsari, Davud ət-Tai, Əsəd bin Amr, Afiyət bin Yezid əl-Avdi, Həsən bin Ziyad, Qasım bin Məan və s. böyük alim və müctəhidlər İmamın dərs halqasında yetişən böyük alimlərdəndir.

İmami-Əzəm Əbu Hənifə, bütün əhli-sünnət tərəfindən hörmət görən dörd böyük müctəhid məzhəb İmamının birincisidir. Məzhəbindəki genişlik və böyüklük baxımından, ona verilən "İmami-Əzəm" adına həqiqətən layiq olduğunu göstərmişdir. Əslində İslamiyyətin ilk feyzli dövrlərində müsəlmanlar arasında bir çox böyük müctəhidlər çıxmışdır. Lakin onların ictihadları və ictihad metodları haqqı ilə mənimsənilməmi, özlərinə tabe olanlar da bu dünyadan köçüncə məzhəbləri davam etməmişdir. İmami-Əzəm isə, özünün

metodları ilə məzhəbinin qalıcı olmasını təmin edən böyük bir cığır açmış və bu səbəbdən məzhəbi davam etmişdir.

Əbu Hənifə hicri 150-ci (m.767) ildə Allahın rəhmətinə qovuşmuşdur. İmami-Əzəm çox dəyərli bir alimdir. Onun qurduğu ictihad müəssisəsi İslam aləmi üçün bir rəhmət vəsiləsi olmuşdur. Adı müsəlmanlar arasında xeyir, rəhmət və şükranla anılır, bu gün dünyanın müxtəlif yerlərində onun qurduğu məzhəbə mənsub milyonlarla insan yaşayır.[106]

---

[106] Abdurrəhman Cəziri, "Dörd məzhəbə görə İslam Fiqhi", 1, "Çağrı yayınları" , 7-ci nəşr, İstanbul, 1993; XIX-XXIII.

## *III - Fiqhi terminlər*

İslam hüququ elminin xüsusi adı olan “Fiqh”, lüğətdə bilmək, anlamaq, şüurlu olaraq idrak etmək, bir şeyin mahiyyətini bilmək, bağlı bir şeyin həqiqətinə varmaq kimi mənaları ifadə edir.

“Fiqh” sözünün termin olaraq mənası isə, “insanın əməl baxımından lehinə və əleyhinə olan şər’i hökmləri bilməsi” deməkdir. Başqa bir tərifə görə də: “Tətbiq etməyə, yəni ibadət, qulluq və muamələtla (ticarət, evlilik, miras və vəsiyyət kimi insanlar arasındakı münasibətlər) bağlı şər’i hökmləri təfsilatlı dəlillərilə bilmək”dən ibarətdir. Bu hökmləri bilən şəxsə də “fəqih” adı verilir.

Məzhəblər isə, Kitab, Sünnət, icma və qiyas üzərinə qurulmuşdur.

***Kitabdan*** məqsəd, Qurani-Kərimdir.

***Sünnət***, Peyğəmbərimizin ﷺ mübarək söz, davranış və əməllərinin cəmini ifadə edir.

***İcma*** isə, Peyğəmbərdən sonrakı bir dövrdə əməli bir məsələnin şəri hökmü üzərində İslam müctəhidlərinin birləşməsidir.

***Qiyas*****,** bir şəri məsələnin hökmünü əsas alaraq, o məsələyə bənzər digər bir məsələ haqqında hökm ortaya qoymaqdır. Qiyas, şəri hökmü məlum olmayan bir hadisəni şəri hökmü bilinən başqa bir hadisəyə bənzətməklə hökm verməkdir. Qiyas, bir ictihad məsələsidir. Bunun məqbul olması şər’ən sabitdir: **“Ey ağıl və bəsirət sahibləri, düşünüb ibrət alın”.**[107]

Qurani-Kərimin əmri buna dəlildir. Allah Rəsulu ﷺ ümmətin fəqihləri üçün belə bir ictihadı caiz görmüş, gözəl qəbul etmişdir.

***Məzhəb,*** lüğətdə gediləcək yol və ya yer mənasındadır. Termin olaraq isə “İmamların seçdikdəri məslək, yol və sistem” deməkdir. Fiqhi məzhəblər sələfi-salehindən sonra ortaya çıxmışdır. Hənəfi, Şafii, Hənbəli və Maliki məzhəbləri isə bunlar arasında ən yayılmış və təqlidçilərinin ən çoxluq təşkil etdiyi məzhəblərdir.

Fiqh kitablarında ən çox işlənən terminlərin tərifləri aşağıdakılardır:

***1. İbadət:*** Lüğətdə “qulluq etmək” deməkdir. Şəriət termininə görə, **“yerinə yetirilməsində savab olub, gözəl niyyətli elə bir əməldir ki, Haqq Təalanı təzim etmək üçün edilir”.** Məsələn, namaz qılmaq, oruc tutmaq kimi ibadətlət.

***2. İtaət*****:** Əmri tutmaq, əmrə bağlanmaq deməkdir ki, buna itaət də deyilir. Şər’ən itaət, **“həm niyyətli, həm niyyətsiz yerinə yetirilməsinə görə savabı olan bir əməldir”.** Məsələn, Qurani-Kərimi oxumaq. Haqq Təalanın əmrlərini könüllü olaraq yerinə yetirmək bir itaətdir.

***3. Qürbət:*** Yaxınlıq deməkdir. Şər’ən, **“Haqq Təalaya mənəvi bir halda yaxınlığa səbəb olan bir gözəl əməldir”.** Məsələn, nafilə qılınan namazlar.

---
[107] Həşr 59/2.

***4. Niyyət:*** Qəlbin bir şeyə əzmlə yönəlməsi deməkdir. Şər'ən, **"yerinə yetirilən bir əməllə Haqq Təalaya itaət etməyi və Ona mənən yaxınlaşmağı niyyət etməkdən ibarətdir."**

Bir əməlin bir ibadət ola bilməsi üçün belə bir niyyətə ehtiyac vardır. Məsələn, biz namazlarımızı Allah-Təalanın əmrinə itaət etmək, rizasını qazanmaq üçün qılırıq. Elə bu, namaz üçün bir niyyətdir.

***5. Təklif:*** Bir kəsə çətin bir şeyi əmr etmək, yerinə yetirməsini zəruri etməkdir. Termin olaraq təklif, islam şəriətinin **"əhliyyət və səlahiyyət sahibi olan"** insanlara bəzi əməlləri etmələrini, bəzilərini də tərk etmələrini əmr etmək və yerinə yetirilməsini zəruri etməkdən ibarətdir. Dinən vəzifələndirilən bir insana isə **"mükəlləf"** deyilir. Cəmdə **"mükəlləfun"**dur.

İnsanlar əhliyyətləri, qüdrətləri ölçüsündə mükəlləf olurlar. Ağıllı və büluğ yaşına çatmış birinin əhliyyəti tam olduğuna görə mükəlləfiyyəti də həmin ölçüdə tam olur.

***6. Ağıl:*** Ruhun bir qüvvəsidir ki, insan onun vasitəsilə bilik sahibi olur. Yaxşı ilə pisi ayırır, əşyanın həqiqətlərini dərk edə bilir. Bu ruhi qüvvəyə sahib olan kəsə **"aqil"** deyilir. Bundan məhrum olana da **"məcnun"** deyilir.

*7.* ***Büluğ:*** Müəyyən yaşa çatmaq, müəyyən keyfiyyətlərə sahib olmaq deməkdir. Belə şəxsə **"baliğ və ya baliğa"** deyilir. Məsələn, ihtilam olan, yəni gördüyü yuxuya görə qüsl vacib olan bir oğlan baliğdir. Evləndiyi halda, uşağı ola bilən gənc oğlan da baliğdir. Eynilə, "heyz" olmaqla qadınlıq adətini görən və ya evlənib hamilə qalan bir qız da, **"baliğa"**dır.

***8. Hökm:*** Qərar, icab yəni lazım olanı yerinə yetirmək, zəruri etmək, təsir etmək, əmr etmək, gözəl aqibət mənalarında istifadə edilir. Termin olaraq, bir şeyin üzərinə düşən, vacib olan nəticə deməkdir. Mükəlləflərin əməllərilə bağlı olan dini hökmlərdən hər birinə **"hökmi-şər'i"** yəni şər'i hökm deyilir. Məsələn, zəkat fərzdir, oğurluq haramdır deyilməsi şər'i bir hökmdür.

***9. Əf'ali mükəlləfin:*** Mükəlləf insanların etdikləri işlərdir ki, fərz, vacib, sünnət, müstəhəb, halal, mübah, məkruh, haram, səhih, fasid, batil kimi hissələrə bölünür.

***1) Fərz:*** Yerinə yetirilməsi dinən qəti surətdə lazım olan bir əməldir.

Fərzlərə əməl edilməsində böyük bir savab vardır. Üzürsüz yerə yerinə yetirilməməsi İlahi əzaba səbəbdir. Qəti bir fərzi inkar, kafirlikdir. Əməli fərzi inkar isə bidətdir, günahdır. Fərzlər 4 yerə bölünür:

***a)*** ***Fərzi-qəti****:* Qəti şər'i bir dəlillə sabit olan, yəni Qurani-Kərimin açıq bir ayəsiylə və ya Peyğəmbər ﷺ hədisinin ifadəsi ilə qəti surətdə təyin edilmiş olan bir fərzdir. Məsələn, namaz və zəkat kimi ibadətlər.

***b)*** ***Fərzi-zənni****:* Müctəhidlərə görə qəti bir dəlilə yaxın dərəcədə qüvvətli görülən zənni bir dəlil ilə sabit olan fərzdir. Bu, etiqad baxımından fərzi-qəti kimi deyil. İnkar edən kafir olmaz. Lakin əməl baxımından fərzi-qəti kimidir. Bu səbəblə ona "fərzi-əməli" də deyilir. Məsələn, dəstəmaz alarkən başın məsh edilməsi, bir fərzi-qətidir. Çünki bu, Quran ayəsinin

(Maidə, 5/6) açıq ifadəsiylə əmr edilmişdir. Lakin ayədə başın nə qədərinin məsh edilməsi təyin edilməmişdir. Bu səbəblə müctəhidlər qəti bir dəlilə yaxın dərəcədə qüvvətli olan zənni bir dəlil ilə başın nə qədərini məsh etməyin fərz olduğuna dair ictihad etmişlər. Hənəfi məzhəbinə görə fərz olan, başın dörddə birinin məsh edilməsidir. Bütün başın məsh edilməsi isə, sünnətdir.

c) ***Fərzi-ayn:*** Hər bir mükəlləfin etməsi gərəkli olan fərzdir. Məsələn, beş vaxt namaz qılmaq, oruc tutmaq və s.

d) ***Fərzi-kifayə**:* Bəzi mükəlləflərin əməl etmələri ilə digərlərindən məsuliyyətin düşdüyü fərzdir. Fərzi-kifayə olan bir vəzifə, mükəlləflərin bir hissəsi tərəfindən yerinə yetirildikdən sonra digərləri məsuliyyətdən azaddırlar. Bu vəzifəni heç kim etməsə, onlardan hər biri müsuliyyət daşıyır. Məsələn, cənazə namazının qılınması, cihad, hökm etmə və fətva işlərinin yerinə yetirilməsi.

***2) Vacib:*** Edilməsi şər’ən qəti dərəcədə bir dəlillə sabit olmamaqla yanaşı, hər halda çox qüvvətli bir dəlillə sabit olan şeydir. Məsələn, vitir və bayram namazları.

Vaciblərə əməl edilməsində savab, tərk edilməsində də əzab vardır. İnkar edilməsi bidətdir, günahdır.

***3) Sünnət:*** Allah Rəsulunun ﷺ fərz olmayaraq etdiyi əməldir. **“Sünnəti-müəkkədə”** və **“Sünnəti-qeyri-müəkkədə”** deyilən iki hissəyə bölünür. Sünnətin cəmi isə “**sünən”**dir.

***a) Sünnəti-müəkkədə:*** Peyğəmbərin ﷺ davam edib çox az halda tərk etdiyi sünnətdir. Məsələn, sübh, zühr və axşam namazlarının sünnətləri.

İslam dinində yerinə yetirilməsi çox vacib olan əzan, iqamə, camaat namazına davamlı qoşulmaq kimi sünnətlərə: **“sünəni-huda”** deyilir ki, bunlar bir sünnəti müəkkədədir.

***b) Sünnəti-qeyri-müəkkədə:*** Allah Rəsulunun ﷺ ibadət məqsədilə bəzən etdiyi əməldir. Məsələn, işa və əsr namazlarının ilk sünnəti.

Peyğəmbərimizin ﷺ yeyib-içməsi, geyinib-keçinməsi, oturub-qalxması kimi hal və hərəkətlərinə də **“sünəni-zəvaid”** adı verilmişdir ki, bunlar da sünnəti qeyri-müəkkədədir.

***Sünnəti-müəkkədə*** və ***sünnəti-huda*** deyilən sünnətlərin yerinə yetirilməsində savab, qəsdən tərk edilməsində isə əzab olmasa da, qınama vardır. Qeyri-müəkkədə və zəvaid deyilən sünnətlərin edilməsi isə çox gözəldir. Lakin tərk edilməsi qınanmağı zəruri etmir.

***4) Müstəhəb:*** Lüğətdə sevilən şey deməkdir. Termin olaraq **“Allah Rəsulunun ﷺ bəzən edib bəzən tərk etdikləridir”**. Məsələn, duha namazı kimi. Bu, bir növ sünnəti qeyri-müəkkədədir.

Peyğəmbər ﷺ, müstəhəb deyilən şeyləri sevib, onların edilməsinə üstünlük vermişdir. Sələfi-salihin[108] də bunlara sevə-sevə əməl etmiş, yerinə yetirilməsini din qardaşlarına tövsiyə etmiş, bu məsələdə rəğbət və təşviq göstərmişdirlər.[109] Müstəhəblərə məndub, fəzilət, nafilə, tatavvu, ədəb adı da verilir. Müstəhəbin edilməsində savab vardır. Edilməməsində isə, qınama, pisləmə və tənzihən olsun kərahət yoxdur.

Şafii fəqihlərinə görə sünnətlərlə müstəhəblər, məndublar birdir; hər hansı bir sünnətə müstəhəb və ya məndub da deyilir.

***5) Halal:*** Şər'ən caiz olandır. Onun edilməsi və istifadəsi qınanmır.

***6) Mübah:*** Edilməsi də, edilməməsi də, şər'ən caizdir. Edilməsində savab, tərk edilməsində isə günah yoxdur. Məsələn, hər hansı halal bir qidanı və ya meyvəni yeyib yaxud yeməmək.

***7) Məkruh:*** Lüğətdə xoşlanmayan çirkin, bəyənilməyən şey deməkdir. Termin olaraq **"Qadağan edildiyi sabitdir, lakin edilməsi doğru olmayıb, tərk edilməsi hər bir halda yaxşı sayılır".**

***8) Kərahət:*** Əsasən bir şeyi pis görmək, bir şeyə razı olmamaq mənasındadır. Şər'ən: **"Tərk edilməsi hər bir halda doğru olan bir şeyin tərk edilməyib yerinə yetirilməsi"** deməkdir. İki hissəyə bölünür.

***a) "Kərahəti-tahrimiyyə"*** - harama yaxın olan kərahətdir.

***b) "Kərahəti-tənzihiyyə"*** - halala yaxın olan kərahətdir.

***9) Haram:*** Edilməsi, istifadəsi, yeyilib, içilməsi şəriətdə qəti bir dəlillə qadağan edilmişdir.

Haram olan şeylərə **"muharrəmat"** deyilir. Haramın edilməsinə görə isə əzab, tərk edilməsinə görə isə savab vardır. Haram olduğu ittifaqla qəti olaraq sabit olan bir əməli halal saymaq isə, insanı imandan çıxarır.

***10) Səhih:*** Rüknlərinin, [110] şərtlərinin tam olduğu bir ibadət və ya muamələdir. Məsələn, fərzlərinə, vaciblərinə riayət edilərək qılınan bir namaz səhihdir.

***11) Caiz:*** Onun edilməsi şər'ən qadağan olunmur. Caiz, bəzən səhih yerinə, bəzən də mübah yerinə istifadə edilir.

Bəzi davranışlar dünya hökmləri baxımından səhih olduğu halda, axirət hökmləri baxımından caiz olmaz. Məsələn, cümə namazı ilə mükəlləf olan

---

[108] "**Sələf**" sözü əvvəlkilər deməkdir. **Salih** isə**,** xeyirli və Allahın rızasını qazanmış insanlar üçün deyilən bir termindir. Termin olaraq **Sələf-i salihin,** başda səhabə, tabiin və təbəi-tabiin dövründə yaşamış salih və xeyirli insanları əhatə edən xüsusi bir konsepsiyadır.Yəni tarixən "səadət əsri" və ona yaxın olan son iki əsrdə yaşamış bütün xeyirli və salih insanlar, sələfi-salihinə daxildir. Səhabələrin hamısı, dörd məzhəb imamı, mühəddislər, müctəhidlərin çox hissəsi bu dövrdə yaşamışdırlar.

[109] Ustad Mahmud Əfəndi (q.s) müstəhəb haqqında belə demişdir: **"Müstəhəb edilməsi sevilən şey deməkdir. Yəni Allah-Təala müstəhəbi, həmin şeyin edilməsini sevir. Ona görə Allah-Təala müstəhəbi edən kəsi də sevər".**

[110] Rükn: təməl, əsas

birinin cümə əzanı oxunduqda alış-verişə davam etməsi kimi. Bu cür davranış səhihdir, lakin mənəvi məsuliyyəti zəruri etdiyi üçün caiz deyildir.

***12) Fasid:*** Əslən səhih olub, vəsfi cəhətdən səhih olmayan, yəni özlüyündə məşru (dinən doğru) ikən qeyri-qanuni bir əməllə birlikdə olduğuna görə məşru olmaqdan çıxan şeydir. İbadət məsələsində fasidlə batil bir hökmdədir.

Qəsdən edilməsi əzaba səbəb olsa da, səhvən edilməsi səbəb deyildir. Məsələn, namaz içində gülmək əsasən səhih olan namazı ifsad edər (pozar).

***13) Batil:*** Rüknlərinin və ya şərtlərinin tamamilə və ya qismən olmadığı hər hansı bir ibadət və ya davranışdır. Məsələn, üzrsüz halda təharətsiz qılınan namaz.

***14) Təharət:*** Lüğətdə nəzafət, təmizlik deməkdir. Şər'ən həbəs, nəcasət deyilən maddi olaraq pis şeylərin və ya hədəs deyilən şər'i bir maneənin aradan qalxmasından ibarətdir.

***15) Hədəs:*** Bəzi ibadətlərin edilməsinə şər'ən mane olan və hökmən nəcasət sayılan bir haldır.

***16) Həbəs:*** Maddi olaraq təmiz olmayan, napak bir şeyə deyilir. Buna "nəcis" və "həqiqi nəcasət" də deyilir. Belə ki, əsasında və ya sonradan əmələ gələn təmiz olmayan bir maddəyə "nəcis" və "nəcasət" deyilir. Məsələn, sidik əsasında nəcis olduğu kimi, sidikli bir geyim də nəcisdir, yəni murdardır. Əsasında murdar olan şeyə "nəcəs" deyilir.[111]

[111] Ömər Nasuh Bilmən "Böyük İslam İlmihalı", s. 45-48, İstanbul, 2003.

# Dördüncü fəsil

# Qadınlara məxsus hallar

- **Heyz əhkamları**
- **İstihazə**
- **Nifas**
- **İyas**

## *I - Heyz əhkamları*

***Heyzin tərifi:***

**“Heyz, ən az 9 yaşına çatmış bir qızın ana rəhmindən xəstəlik olmadan axan və 3 gündən az, 10 gündən çox olmayan axan qandır.”**[112]

***Heyz qanının rəngi:***

Heyz qanı müxtəlif rənglərdə ola bilər. Qara, qırmızı, bulanıq, sarı, torpaq rəngi və yaşıl rəngdə də axa bilər.

***Heyzin minimal və maksimal yaşı:***

Heyzin minimal yaşı 9 yaşdır. Heyz qanı ana rəhmindən gəlməlidir. Arxa yoldan və ya başqa yerdən axan qan heyz sayılmır.

Heyzin maksimal yaşına gəlincə isə, onun müəyyən yaş vaxtı yoxdur. Qadın erkən yaş dövründə də, heyzdən kəsilə bilər, gec də kəsilə bilər.

***Heyzin minimal və maksimal gün sayı:***

Heyz minimum 3 gün, maksimum isə 10 gün olur.[113]

***Qadınlar heyz hökmlərini öyrənməklə mükəlləfdirlərmi?***

Qadına ehtiyacı olan heyz hökmlərini öyrənməsi vacibdir. Əri və ya vəlisi də bunları bilməlidir. Əks halda, bir alimdən, bir hocadan soruşmaq üçün evdən çıxmasına izn verməlidir. Bu işdə qadına mane olmaları haramdır yaxud özləri soruşub qadına bildirməli və onun ehtiyaclarını aradan qaldırmalıdırlar. Qadına izn verməsələr belə, o iznsiz evdən çıxa bilər.

İbn Nuceym (ö/1562) belə demişdir: **“Təharət, namaz, Quran qiraəti, oruc, etikaf, həcc, həddi-büluğ, cinsi yaxınlıq, talaq, iddət, istibra və digər bitmək bilməyən hökmlərin bəziləri qadınlar üçün tərtib edildiyinə görə ən önəmli işlərdən biri də, həmin məsələləri öyrənməkdir. Çünki bir şeyi bilməyin önəmi, həmin şeyi bilməməyin verdiyi zərərlə tərs mütənasibdir. Heyz məsələlərini bilməməyin verdiyi zərər isə, digər məsələləri bilməməyin verdiyi zərərdən daha çoxdur. Bu səbəblə də heyz məsələlərində diqqətli olmaq vacibdir.”**[114]

---

[112] “Haşiyətu İbn Abidin”, 1/188.

[113] **Şafii** məzhəbinə görə heyzin ən az müddəti, qanın kəsilməməsi şərti ilə, bir gün bir gecədir. Ən çox müddəti, arada kəsilsə belə, gecələri ilə birlikdə on beş gündür. Bir qadın on beş günə qədər fasiləli olaraq qan görüb, lakin gördüyü müddət cəmi iyirmi dört saat olarsa, on beş gün heyz sayılır. Cəmi iyirmi dört saatdan az olarsa heyz deyil, fasid bir qandır.

[114] “Əl-Bəhr-ur-raiq”, 1/199; “Məcmuətu rasəili İbn Abidin”, 1/70.

### *İki heyz arasında minimaı təmizlik müddəti*

Məzhəbin məşhur görüşünə görə, iki heyz arasındakı minimal təmizlik müddəti on beş gün və on beş gecədir.

Maksimal təmizlik müddətinin isə, həddi yoxdur. Bu, icma olan görüşdür. Çünki qadın bəzən aylarla-illərlə, bəzən də tamamilə heyz olmur.[115]

### *Təmizliyin əlaməti*

Heyzdən təmizliyin iki əlaməti var:

*1)* ***qanın kəsilməsi;***

*2)* ***ağ axıntı görmək.***

***Qanın kəsilməsi*** dedikdə, bez parçasının qana və ya bulanıq axıntıya yaxud sarı ləkəyə kirlənmədən, quru qalmasıdır. Bunların hər birindən bez quru olduğu zaman, sonradan cinsiyyət üzvünün rütubətiylə islanmasının bir zərəri yoxdur.

***Ağ axıntı,*** heyzin sonunda qadının üzvündən gələn ağ sudur. Çünki Aişədən (r.a): "Səhabə qadınları, (heyz dövründə) fərclərinə yəni cinsiyyət üzvlərinə qoyduqları, üzərində heyz qanının sarı ləkəsi olan pambığı göndərərdilər və namaz haqqında soruşardılar. Onlara: **"Ağ axıntını görənə qədər namaz qılmaq üçün tələsməyin"** deyərdi.

Fiqhdə qandan kəsilmə belə açıqlanmışdır: **"Qan kəsildikdən sonra ağ nəm axıntı çıxsa da ya çıxmasa da, qadın təmizdir."**

### *Heyz yaşayan qadınlar*

Mübtədəa, mötədə və mutahayyirə qadınlar, heyz olan qadınlardır

***Mübtədəa qadın*:**

***Mübtədəa***, ilk dəfə heyz və ya nifas olan qadındır. Yəni bu qadınlar normal olaraq, 3 gündən az və 10 gündən çox olmayan qan görən qadınlardır.

Onların iki halı var:

***Birinci hal: qanın maksimal heyz müddətini keçməməsi.***

Həm tam 10 gün, həm də də 10 gündən az (ən az 3 gün) qan görə bilər. Daha sonra qan dayanarsa, bütün gördüyü qan günləri heyzdən sayılır. O, bu vaxt ərzində heyzli qadına vacib olanları etməlidir.

---

[115] **Şafii** məzhəbinə görə heyzdən sonraki təmizlik müddəti ən azı on beş gündür. Yəni bu müddət iki heyz qanı arasındakı müddətdir. Nifas və heyz qanları arasında təmizliyin ən az müddətinə hədd yoxdur. Təmizlik müddəti üçün ən yuxarı hədd yoxdur, nə qədər çox olarsa olsun, fərq etmir. Lakin əksər halda görülən təmizlik müddəti bir aydan altı və ya yeddi gün çıxdıqdan sonra qalan müddətdir.

***İkinci hal: Qanın maksimal heyz müddətini keçməsi.***

Əgər qan heyzin maksimal müddətini (10 günü) keçərsə yalnız 10 gün heyz sayılır. Bundan sonra gələn qan isə istihazə qanıdır. Buna əsasən deyirik ki, bu qadının adəti hər ayın 10 günü, təmizliyi isə ayın qalan iyirmi günüdür. Çünki 10 gün heyz sayıla biləcək müddətin maksimal həddidir.

***Mötədə qadın:***

.***Mötədə*** qadın, daha əvvəl səhih heyz və səhih təmizlik müddəti yaxud ikisindən birini görən qadındır.

Mötədə qadında adətin təyini bir heyz müddəti ilə müəyyən edilir.

***Mötədə qadın adətinə müxalif qan görməsi***

Mötədə qadın adətinə müxalif qan görməsi iki cür olur:

1. ***Qanın adətdən tez kəsilməsi;***
   a) qan 3 gün axıb, sonra kəsilmişdir
   b) qan 3 gündən az axıb kəsilmişdir

Əgər 3 gün qan görmüşsə sonra kəsilərsə, qüsl alar və təmiz qadınlara halal olanlar ona da halal olar. Eləcə də, fərz ibadətləri yerinə yetirməsi vacib olar. Lakin əvvəlki heyzi qədər müddətdə cinsi əlaqədə olmaqdan çəkinərək gözləyər. Qüsl alarkən isə, namazın müstəhəb (son) vaxtına az bir müddət qalana qədər gözləyər.

Lakin əgər 3 gündən az qan görüb daha sonra qanı kəsilmişsə, hər namaz vaxtı dəstəmaz alıb namazını qılar. Çünki bu qan 3 gündən az olduğu üçün istihazə qanıdır.

2. ***Qanın adətdən gec kəsilməsi.***

Qan adətdən gec kəsilərsə, 2 hal ola bilər:

***1) 10 gündən az və adətdən çox olması;***

Əgər axan qan 10 gündən az olub, adət günlərindən çoxdursa, bu zaman adət dəyişmiş olur.

***2) 10 gündən çox olması.***

Əgər qan 10 günü keçərsə, əvvəlki adəti heyz, bundan sonrakı qanı istihazə sayılır.

Həmçinin, digər bir hal da ola bilər:

***Heyzdə bir gün qan, bir gün təmiz görməsi adəti olan qadınlar.***

Belə hal on günə qədər davam etdiyi halda;

***1-ci gün -*** qan gördükdə namazı və orucu tərk etməlidir;

***2-ci gün*** - təmiz olduqda dəstəmaz alıb namazını qılar;

***3-cü gün*** - namazını və orucunu tərk edər;

***4-cü gün -*** qüsl edib namaz qılar. Beləcə onuncu günə qədər əməl edər. Bu əməllər, adəti əvvəldən bir gün qan və bir gün təmiz olan qadınlara aiddir.

*Adətin intiqalı (dəyişməsi)*

***Naqis təmizlik və adətin dəyişməsi:***

Əgər qan on gündən çox gələrsə, qadının heyzi adətinə yəni adətən gördüyü qan günlərinə qayıdır. Artıq olanı isə, xəstəlik (üzr) qanı sayılır. Çünki aralarında bir tam təmizlik (15 gün) vaxtı olmadan qanı mütəmadi axmışdır.

İzahı "Tatarxaniyə" və "Əl-Bəhr" fiqh kitablarında qeyd olunmuşdur: **"Adət günləri ayın ilk beş gün olan misalımızdakı qadın, ayın ilk günləri qan görsə, lakin qan beş gün deyil, altı gün sürsə, altıncı günü də heyz qanıdır. Daha sonra on dörd gün təmiz olub, təkrar qan görərsə, bu dəfə ilk adətinə qayıdar. Yəni altıncı gün gördüyü qanı adət deyil, istihazə qanı sayar və ibadətlərini qəza edər. Deməli, ilk gördüyü adətində heyz saydığı altıncı günün namazlarını qəza edər. Çünki minimal təmizlik, on beş gündür".**

***Ayın ilk beş günü adət olan qadın***




***Adətin gün sayına görə dəyişməsi:***

Adətinə zidd olan bir şey görən mötədə qadında heyz qanı on günü keçmədikdə, qan gördüyü bütün günlər heyzdir. On beş gün səhih təmizlik gördükdən sonra adət ancaq gün sayı olaraq intiqal edə bilər.

On günü aşan günlərdə isə, əvvəlki müntəzəm adətindən ən az adət gününə, yəni üç günə rast gəlinsə, lakin həmin günlər əvvəlki adət günlərinə bərabər olmazsa, əvvəlkindən az da olsa, adət həmin ikinci adətin gün sayına keçmişdir və o, adətinin müddəti olmuşdur.

***Misal:***

Adət günləri ayın ilk beş günü olan bu qadın, ayın ilk iki günündə təmiz olub, ardından on bir gün qan görsə, qan gördüyü günlərin ilk üç günü əvvəlki adətinə düşdüyü və ən az adət ölçüsünü (3 gün) doldurduğu üçün adəti sayılır.

Bu halda onun adəti vaxta görə deyil, gün sayına görə dəyişərək beş gündən üç günə keçmişdir. Qalan səkkiz gün isə xəstəlik qanıdır.




On günü aşan bu qan günləri içərisində, əvvəlki adət günlərinin ən az bir adət ölçüsü (nisabı), yəni üç gün olarsa, sadəcə bu üç gün adətdir, qalan günlər xəstəlik qanıdır.

Əvvəlki adəti on gündən yəni maksimal heyz müddətindən artıq vaxt içərisində olarsa, onda adət gün sayı və zaman olaraq dəyişməmiş, olduğu kimi qalmışdır. Müddətdən artıq olanı isə, xəstəlik qanı olur.

***Misal:***

Adəti hər ayın ilk günündən etibarən beş gün olan qadın, bir dəfə ayın əvvəli olmadan beş gün qan görərsə və qan davam edib adət günləri olan ayın ilk beş günündə və ardından bir gün də artıq qan gələrsə (cəmi 11 gün), əvvəlki adəti kimi ayın ilk beş günündə gördüyü qan adət qanı, öncədən beş və sonradan bir gün gördüyü qan isə xəstəlik qanıdır.

Əksi halda, gördüyü adət gün sayı olaraq dəyişmiş sayılır və bu hal naqis haldır. Çünki adətindən artıq günlərin adət vaxtına düşməsinə ehtimal yoxdur.




***Adətin vaxta görə dəyişməsi:***

Mötədə qadın adət vaxtı ümumiyyətlə qan görməz. Bundan sonra ənənəvi adət günləriylə eyni sayda heyz qanı görərsə, adətinin vaxtı dəyişmiş olur. Məs: Hər ayın ilk 5 günü adət görən qadın, növbəti ayın ilk 5 günü qan görməyib ikinci 5 günü qan görərsə bu zaman adətinin gün sayı sabit qalsa da, adət zamanı dəyişmişdir.

*Adətin həm gün, həm də zaman baxımından dəyişməsi*

Mötədə qadın adət vaxtı heç qan görməz. Bundan sonra əvvəlki adətindən fərqli günlərdə qan görərsə bu zaman adəti həm zaman, həm də gün sayı olaraq dəyişər.

***Misal:*** Hər ayın ilk 5 günündə adət görən qadın, növbəti ayın ilk 5 günündə qan görməz, daha sonra ən az 3 gün qan görərsə adəti həm zaman, həm də gün sayı olaraq dəyişər.

***Mutahayyirə qadın:***

***Mutahayyirə,*** adət günlərinin sayını və ya vaxtını unudan qadındır.[116] Çünki, bu halda olan qadın müntəzəm adət gördükdən sonra davamlı qan gördüyünə görə, əvvəlki adətini unutmuşdur. Onun adətli və ya təmiz olduğunu hökm edilə bilməz. Yəni mutahayyirə qadın, məscidə girə bilməz, Quran oxuya bilməz, cinsi əlaqədə ola bilməz. Hər namaz üçün qüsl edər və namazını qılar.[117]

***Təmizliyin növləri***

Təmizliyin 4 növü var:

1) ***Səhih;***
2) ***Fasid (pozulmuş);***
3) ***Tam;***
4) ***Naqis.***

***Səhih təmizlik,*** on beş gün və daha çoxdur. Bu müddət ərzində, əvvəlində, ortasında, axırında mütləq şəkildə qan ləkəsi görünməz. Səhih təmizlik iki səhih heyz qanı arasında olur.

***Fasid təmizlik*** isə, on beş gündən az olub ya qanla qarışıq olur, ya da iki səhih heyz qanı arasına düşür. Ona görə bu təmizlik, səhih təmizliyin əlamətlərinin birinə zidd olan təmizlikdir.

Həmçinin, fasid təmizlik davamlı gələn qan kimi ardıcıl olur.

***Misal:***

Mübtədəa qadın on bir gün qan və on beş gün təmizlik görər, lakin bu təmizliyi qanla başlamışdır (qanı on gündən çox olduğuna görə fasiddir). Burada təmizlik zahirən səhihdir, çünki on beş günə tamamlanır. Lakin o mahiyyətinə görə fasiddir. Ona görə on birinci gün (təmizlik müddətinə aid olduğu üçün)

---

[116] **Şafiiyə** görə , **mötədə qadın,** əvvəldən heyzi və təmizliyi olan və ikisinin də vaxtını bilən qadındır.
İmam Şafii **mutahayyirə qadının** tərifini belə vermişdir**: "O muməyyiz olmayan, adətini unudan, istihazə görən qadındır və ona "dallə", "mudillə" və "muhayyira" deyilir"**
[117] Zeyləi, "Təbyin-ul-haqaiq", 1/62-63.

namaz qılar. Bu ümumən təmizlik sayılır, amma bu təmizlik müddətinin əvvəli qana qarışmış və fasid olmuşdur.




***Tam təmizlik*** isə, on beş gün və daha çox olan təmizlikdir. Bu təmizlik, səhih də ola bilər, və ya fasid də.

***Naqis təmizlik,*** on beş gündən az olan təmizlikdir və o fasid təmizlik növündəndir.[118]

### *Hamiləlik qanı*

Hamiləlik qanı, xəstəlik və fasid qanıdır, heyz qanı deyil. Fiqh alimləri bu hədisi əsas almışlar: Peyğəmbərin ﷺ Sibyi Əutasa: **"Hamilə olanlar doğum edənə qədər, hamilə olmayanlar isə heyzi bitənə qədər cinsi əlaqədə olmasınlar"** – deyə buyurdu.[119] Heyz ana rəhminin (qandan) azad olmasının əlamətidir. Bu hədis, hamiləliklə heyzin bir araya gəlmədiyinə işarət edir.

### *Heyzdən ortaya çıxan hökmlər*

***1) Həddi-büluğ.***

Heyzlə mükəlləfiyyət əldə edilir və o, həddi-büluğ əlamətlərindən biridir. Qadın heyzin mümkün zamanında qan gördükdə, mükəlləf olan, baliğa yəni yetkinlik yaşındakı qadınlara vacib olanlar, həddi-büluğ olmuş bir qızın üzərinə də vacibdir. Çünki, Peyğəmbər ﷺ buyurdu: **"Allah, həddi-bülûğ çağına çatmış qızın namazını ximarsız[120] qəbul etməz".**[121]

Heyzlə büluğa çatdığı üçün qıza örtünmək vacib olur və bu, onun mükəlləf olduğunu göstərir**.**

***2) Təmizlənmə***

Fiqh alimləri qeyd edir ki, heyzli qadın cənabət qüslu aldığı zaman o qüslu səhih olmaz. Məsələn, heyzli bir qadın gecə ihtilam olduqdan sonra cənabət qüslu alarsa, onun qüslu səhih sayılmır.

---

[118] "Məcmuətu rasəili İbn Abidin", 1/76.
[119] Əbu Davud, 3/614, və İbn Həcər "Ət-Təlxis", 1/172.
[120] Qadının başını və sinəsini örtən hicab, örtük.
[121] Əbu Davud, 1/421; Tirmizi, 2/215.

### *Spiral və adətin nizamsızlığı*

Spiral qoyduran qadınlar adətən təmiz olduğu günlər qan ləkələri görürlər. Belə olan halda qüsl edəcəklərmi? Buna səbəb spiral olmuşsa hökm dəyişirmi?

Qadının heyzi qurtarıb qüsl aldıqdan sonra təmizlik müddəti ərzində görəcəyi ləkələrə görə sadəcə dəstəmaz almalıdır. Bu ləkələrin çox olması bir şeyi dəyişdirmir. On beş gün belə davam edərsə və adət müddətinin yeri bəlli deyilsə, təmizlikdən sonra görəcəyi hər ləkəni adət sayar, ona görə davranar. Buna spiralın səbəb olması bir şeyi dəyişdirməz.[122]

Beləliklə, əgər spiral qoydurmadan əvvəl bir qadının müntəzəm adəti olmuşsa, ona görə hesablayar. Bundan sonrakı günlərdə üzürlü hal sayılacaq. Ancaq davamlı qan görürsə, 10 gününü adət, sonrakı 15 günü təmizlik müddəti sayaraq ibadətlərini edər.

### *Cinsiyyət üzvündən çıxan məzinin hökmü*

Səhl b. Huneyfdən (r.a) edilən rəvayətdə belə deyilir: “Məzi axıntısına görə sıxıntı və çətinliklə qarşılaşırdım və bu səbəblə tez-tez qüsl alırdım. Bu halımı Allah Rəsuluna ﷺ danışdım, buyurdu: **“Ondan ötrü sadəcə dəstəmaz almağın kifayətdir...”** Sonra soruşdum: “Ey Allahın Rəsulu! Əgər paltarıma axıntı toxunsa nə edim? Buyurdu: **“Bir ovuc su götür, ondan paltarının batdığı yeri gördüyün qədər yu...”[123]**

***Hədisdən çıxarılan hökmlər:***

1- Şəhvani bir hissdən sonra axan incə sarımtıl bir suya görə qüsl gərək deyil.
2- Məzidən sonra dəstəmaz pozulur. Namaz üçün yenidən dəstəmaz almaq lazımdır.
3- Məzi nəcisdir. Cinsiyyət üzvü su ilə yuyulur. Paltara batan hissəsini də yumaq lazımdır.

### *Cinsiyyət üzvünə qoyulan pambıq və s. dəstəmazı pozurmu?*

Fərcin xaricinə pambıq qoyan qadın islandığı halda, dəstəmazı pozulur. İslaqlıq pambığın xaricinə çıxıb çıxmaması, hökmən eynidir. Çünki axıntının fərcin daxilindən gəldiyi yüz faiz bəllidir.

---

[122] Dr. Faruk Beşer, “Hanımlara fetvalar”, 1/71, İst. 1990.
[123] Əbu Davud, Təharət, 82; Tirmizi, Təharət, 84; İbn Macə, Təharət, 70; Əhməd b. Hanbəl, 3/484.

Qadında cinsiyyət üzvünün xaricinə qoyulan pambıq islanarsa və ya daxilə qoyulan şey islanmış vəziyyətdə düşərsə dəstəmaz pozulur. Əgər islanmamışsa, dəstəmaz pozulmaz.

Əgər bir dəstəmazla 2 və ya daha artıq vaxtın namazı qılınacaqsa, dəstəmazın pozulmasının qarşısını almaq üçün övrət yerinə dezinfeksiya edilmiş yəni steril kiçik bir pambıq və ya bez parçası qoyula bilər. Ancaq bu parçanın yerindən oynamaması və ya islaqlıq pambığın xaricinə çıxmamalıdır.

Qadın adət qanının axmasını bir müddətə əngəlləmək və üzürlü halını ortadan qaldırmaq üçün pambıq istifadə edərək (adət və ya xəstəlik qanını) pambıqla qarşısını alsa da, yenə də adətli və ya üzürlü sayılır. Adət günləridirsə namaz və digər ibadətləri etməz, üzürlüdürsə hər namaz vaxtında dəstəmaz almalıdır.

### *Heyzli qadına haram olan əməllər*

***1.Namaz.***

### *Namazda ikən adət görən qadın necə davranar?*

Qadın nafilə (sünnət) namazına niyyət etdikdən sonra heyz olarsa, namazını qəza edər. Çünki bu şər'i olaraq vacib olmuşdur. Fərz namaza niyyət etdikdən sonra namaza başlayıb, namaz əsnasında heyzi başlayarsa, namazı pozulur və o namazı qəza etməz.[124]

Qadın, heyzi başlamadan əvvəlki vaxtda namaz qılma imkanı olduğu halda, qılmadığı namazların borcu üzərində qalır.[125]

Bir qadın, vaxtın sonunda o vaxtın namazını qılmağa başladıqdan sonra heyzli olmuşsa, daha sonra o namazı qəza etməz, nafilə (sünnət) namazını qəza edər.[126]

### *Adətin başlanğıcında və sonunda namazın hökmü*

Heyz vaxtının qurtarmasıyla qadına namaz fərz olur. "Qüsl etmədikcə fərz olmaz" inancı səhv bir şeydir. Qüsl etməsə də, namaz fərz olur və qılmadığı üçün günahkar olur. Ötürdüyü namazların qəzasını etməlidir.

---

[124] İbn Abidin, 1/476.

[125] **Şafiilərə** görə heyz namazın əvvəl vaxtında başladıqda, qadına ancaq həmin vaxtın namazı vacib olur. Lakin namazı qılmağa bir fərz namaz miqdarı çatarsa, ona sonrakı (növbəti) namazı cəm etməsi vacib deyil. Əvvəlki fərz namazını isə birləşdirmək vacibdir.

[126] "Fətəvayi Hindiyyə", 1/139.

Bir qadın, gecə təmiz yatıb, heyzli oyanarsa, həm də heyzli yatıb təmiz oyandığı halda, işa namazını qılmamışsa, hər iki vəziyyətdə də ehtiyatən işa namazını qəza edər. Yəni namaz vaxtı çıxmadan təmiz halda işa namazını qılmadan yatarsa və vaxtı çıxınca heyzli olaraq oyanarsa, o namazı qəza edər. Çünki bu qadının heyzli olduğuna ancaq vaxt çıxdıqdan sonra oyandığında hökm etdiyimizə görə əvvəlki vaxtın (işa namazı) sonunda onu təmiz qəbul edirik.

Bir qadın, heyzli olaraq yatıb vaxt çıxdıqdan sonra təmizlənmiş olaraq oyanarsa, yataraq ötürdüyü o namazı qəza etməlidir. Çünki yatdığı vaxtdan etibarən təmiz olduğunu qəbul etdik. Vaxtın sonunda təmiz olduğuna hökm verdiyimizə görə namazın qəzası lazımdır. Çünki qadın yatarkən qanın axdığı məlum deyil. Yatdığı andan etibarən təmiz sayılır.[127]

İlk adət görən (mübtədəa) qadın 10 gündən əvvəl və adətli olan (mötədə) qadın da, adətindən daha qısa bir müddətdə təmizlənmişsə (yəni qanı kəsilərsə), dəstəmaz və qüslunu, namazın son vaxtına qədər təxirə salar. Lakin bu təxiri namazın kərahət vaxtına girməsinə səbəb ola biləcək qədər gec olmamalıdır.[128]

### *Namazın çıxmasına az qala heyzin bitməsi*

Maksimal heyz müddətində (10 gün) və 10 gündən əvvəl qanın kəsilməsinə görə mübtədəa və ya mötədə qadında təharət və namaz məslələri aşağıdakı kimidir:

***1) 10-cu günündə qanın kəsilməsi.***

Mübtədəa qadına namaz vaxtına qədər təkbir miqdarı və qüsl almağa vaxt qalarsa, həmin vaxtın namazını yerinə yetirmək vacibdir. Lakin vaxt qalmasa, namazın nə qəzası, nə də ədası olur. **M**ötəbər rəyə görə, bir təkbir müddəti, namaz vaxtının son hissəsidir. Əgər həmin müddətdə qadın təmizdirsə namaz vacibdir, əks halda vacib olmur.

*2)* ***10 gündən əvvəl qanın kəsilməsi.***

Mübtədəa qadında 10 gündən əvvəl, mötədə qadında isə, adət günlərindən sonra qan kəsilərsə, ona namaz vaxtına bir təkbir zamanı qalsa belə, namazı qəza etməsi lazımdır. Qüsl üçün su tapmadıqda təyəmmüm edər. Burda namaz vaxtına qədərki zamana qüsl və ya təyəmmümə bir təkbir vaxtı da əlavə edilməlidir. Çünki qüsl və ya təyəmmüm zamanı heyz zamanına aiddir və bunlardan (qüsl və təyəmmümdən) əvvəl heyzdən təmizlənmə hökmü yoxdur.

Əgər qüsl və ya təyəmmümdən sonra bir təkbir vaxtı qalmadıqda, namazın qəzası vacib deyil.

---

[127] İbn Abidin, 1/477.
[128] "Fətəvayi Hindiyyə", 1/139.

10 gündən əvvəl qanın kəsilməsi, 1-ci haldan fərqlidir. Çünki 1-ci halda ən çox heyz müddəti 10 gündən artıq olmadığına görə qüsl və ya təyəmmüm etdiyi zamanı təmizlik müddətinə düşür. Ondan sonra namaza qədər təhrimə (təkbir) vaxtı çatıb qüsl etməzsə, həmin vaxtın namazını qəza etməsi lazımdır. Burda qüsldan məqsəd, qüsldan əvvəlki əməllər də (su axtarması, paltarın soyunması, başqalarından örtünməsi) nəzərdə tutulur. Fərz qüslda edilənlər sünnət qüslda istənilmir.[129]

### *Heyzli qadın namaz vaxtları nə edər?*

Alimlər: "Heyzli qadının hər namaz vaxtı üçün dəstəmaz alaraq namaz yerində o namazı qılacaq qədər oturması, təsbih ("Subhanəllah" zikri) və təlil ("Lə iləhə illəllah") ilə məşğul olması müstəhəbdir" demişlər. Bir rəvayətdə isə: "Bu qadına əvvəlcə qıldığı namazların ən gözəlinin savabı verilir" buyrulmuşdur.[130]

### *Heyzli qadının qüslu*

Fiqh alimləri heyzin qüslu vacib edən səbəblərdən biri olduğu barədə ittifaq etmişlər. Qan kəsildikdə, qadına heyz vaxtı qadağan olunan şeylərin caiz olması üçün qüsl alması vacibdir. Çünki Peyğəmbər ﷺ Fatima bint Əbu Hubeyşə belə buyurdu: **"Heyz olduğun günlər namazı tərk et, sonra qüsl alıb namazı qıl"**. Eləcə də, bunu Ümmü Həbibəyə, Səhlə bint Suheylə və digər qadınlara əmr etmişdir. Allah-Təalanın bu kəlamı da hədisi təsdiqləyir: **"Təmizlənməyənə qədər onlarla yaxınlıq etməyin".**[131] Yəni qüsl edənə qədər cinsi yaxınlıq etməyin. Demək, qüsldan əvvəl kişinin xanımı ilə yaxınlığı qadağan edilir və cinsi əlaqənin mübahlığı üçün qüslun vacibliyinə işarət edilir. Fiqh alimləri arasında qan kəsilməsinin qüslun səhihliyi üçün şərt olması barədə bir xilaf yoxdur.[132]

---

[129] **Şafiilərə** görə heyzli qadın namazın axır vaxtına təmizlənib bir təkbir qədər çatdığı halda, ona namaz vacibdir. Vaxtında olan namazını ondan əvvəlki namazla birləşdirməyibsə, yalnız vaxtın namazının qəzası ona vacibdir. Lakin əgər namazları birləşdirmişsə, vaxtdan əvvəlkinin və həmin vaxtın namazının qəzası qadına vacibdir.
Gün doğmadan əvvəl təmizlənib və bir təkbir qədər vaxt qaldığı halda, ona yalnız sübh namazını qəza etməsi lazımdır. Lakin gün batmadan əvvəl bir təkbir vaxtı qədər təmizləndiyi halda, o zühr və əsr namazlarını qəza etməlidir. Eləcə də, dan yeri sökülmədən əvvəl bir təkbir vaxtı qədər təmizləndikdə, məğrib və işa namazını qəza etməsi lazımdır.
[130] İbn Abidin, 1/477.
[131] Bəqərə 2/222.
[132] **Şafiilər** isə bu şərtə namaz qılmaq və bənzəri ibadətləri də artırmışlar. Yəni qüslun sayılması üçün qanın kəsilməsi, həmçinin namaz qılmaq üçün qüsla niyyət etmək qüslun şərtidir. Namaza qılmaqdan məqsəd, onun həqiqətən nafilə və ya qəza namazı qılması və ya hökmi olaraq artıq fərz namazı qılmasıdır. Burda onun niyyət halında olması nəzərdə tutulur. Vaxtın daxil olması

Heyz qüslu cənabət qüslu kimi verilir. Qüsl zamanı müşkü ehramda olan və ərinin yasını saxlayan qadın sürtməz[133] Müslimin "Səhih"ində Aişədən (r.a) belə rəvayət edilir: "Əsma (r.a) Peyğəmbərdən ﷺ heyz qüslu barədə soruşdu. "Allah Rəsulu ﷺ belə buyurur: **"Sizlərdən biri heyzdən qüsl almaq istərsə su və sidrlə[134] övrət yerini gözəl şəkildə təmizləsin. Sonra başı üzərinə suyu töküb saç diblərinə çatana kimi ovxalasın sonra yenə suyu başının üzərinə töksün və müşk vurulmuş bez parçasını götürüb onunla paklansın"**. Əsma dedi: "Onunla necə təmizlənim? Buyurdu: **"Subhənallah. Müşklə təmizlən"**. Aişə (r.a) qadını özünə tərəf çəkərək yavaş şəkildə (qulağına) belə dedi: "O müşk parçasını qanın gəldiyi yerə sürtərsən". Sonra Əsma cənabət qüslu haqqında soruşdu. Allah Rəsulu ﷺ: **"Su alıb təmizlənər, gözəl bir şəkildə təmizliyini edər. Sonra başına su töküb saç diblərinə çatana qədər yaxşıca ovxalasın. Daha sonra da üzərinə su tökər"**[135] buyurdu. Sonra Aişə (r.a) dedi: **"Ənsar qadınları nə yaxşı qadınlardır! Həya etmək onları din haqqında lazım olan biliyi öyrənmələrinə mane olmadı".**

### *Heyzli qadının təmiz sayılması*

Heyzli qadının bədəni, təri, artığından qalan yeməyi və suyu ittifaqla təmizdir. Onun yemək bişirməsi, xəmir yoğurması caiz olduğu kimi, onunla birgə yemək yemək və bir yerdə yaşamaqda da nəinki qadağan, heç məkruh da deyil.

Rəvayət olunur ki, yəhudilər heyzli qadınla yemək yeməz və eyni evdə (yaxud eyni otaqda) yaşamazlardı. Səhabələr bu haqda Peyğəmbərə ﷺ sual verdikləri zaman, "əl-Bəqərə" surəsinin **"Səndən qadının heyzli halı haqda soruşurlar"** deyə başlayan 222-ci ayəsi nazil oldu. Bu zaman Peyğəmbər ﷺ: **"Cinsi münasibətdən başqa hər şey edə bilərsiz"**- buyurdu.

Yəhudilər Peyğəmbərimizin ﷺ bu sözünü heyrətlə qarşıladılar. Useyd ibn Hudayr və Abbad ibn Bişr gələrək belə dedilər: "Ey Allahın elçisi, yəhudilər belə-belə (heyzli qadınla bir yerdə yaşamanın, onunla birgə yemək yeməyin şərrə və bərəkətsizliyə yol açdığını) deyirlər, biz də (bundan ehtiyat edərək) heyzli qadınlarla birgə yaşamasaq olarmı?" Bunu eşidən Peyğəmbərin ﷺ üzü (yəhudilərin bu iddiası səbəbiylə) elə hal aldı ki, biz o ikisinə (Useydlə Abbada) qarşı qəzəbləndiyini zənn etdik.[136]

---

ilə namaz və şərtlərinə əməl etmək ona vacib olur. Belə ki, o həqiqətdə namaz qılmaq üçün qüsl etmək niyyəti etməsə belə, şəriət qadından namaz qılmağı tələb edir və qadın şəriətə görə qüsl niyyətində olmuş kimi olur. "Haşiyətu Əd-Dəsuqi", 1/130; "Nihəyətul muhtəc", 1/211.

[133] "Məcmuətu rasəili İbn Abidin", 1/84.

[134] Burda məqsəd,o yeri yumadan əvvəl sidrlə sabun əvəzi sürtməkdir. Sidri olmayan kəs gözəl qoxulu sabundan istifadə edə bilər.

[135] Başın dibləri, saç kökləri və kəllə sümüyündəki xət dibləridir ki, sümüyün üzərində toplanmışdır.

[136] Müslim, 1/246.

Başqa bir dəlil isə budur ki, Peyğəmbərimiz ﷺ məsciddə ikən, Aişəyə "səccadəni mənə ver"- demişdi. Aişə - "mən heyzliyəm (səccadəyə necə toxunum, yaxud əlimi otağın pəncərəsindən məscidə necə salım?)"- dedikdə, Peyğəmbərimiz ﷺ: **"Heyz (qanı) sənin əlində deyil** (əlinə bulaşmayıb, bu səbəbdən əlinlə səccadəyə toxunman, yaxud əlini məscidə salman qadağan deyil)"-buyurmuşdur.[137]

Peyğəmbərimiz ﷺ, Aişənin heyzli olduğu halda artıq buraxdığı sudan içər, hətta ağzını Aişənin ağzını qoyduğu yerə qoyardı.[138] Həmçinin Aişə heyzli olduğu halda Peyğəmbərimizin ﷺ başını yuyardı.[139]

### *Heyz namazın səhihliyinə mane olurmu?*

Fiqh alimləri, heyz, namazın səhihliyinə mane olduğuna görə heyzli ikən namaz qılmanın səhih olmadığı barədə ittifaq etmişlər.

Eləcə də, səcdə, namazın bir rüknü olduğuna görə heyzli qadına tilavət və şükr səcdəsini etmək haramdır.

Heyz günlərində qadının ötürdüyü namazların qəzası vacib deyil. Muazət belə rəvayət etmişdir: "Aişədən (r.a) soruşdum: "Heyzli qadının orucu qəza etməsi, namazı isə qəza etmədiyi barədə fikrin nədir?" Dedi: "Sən Həruriyyəsən?" Muazət: "Xeyr, Həruriyyə[140] deyiləm, lakin soruşuram". Aişə (r.a): **Biz orucu qəza etməyə, namazı isə qəza etməməyə əmr olunduq"**.[141]

### *2.Oruc.*

Heyzli qadına fərz və ya nafilə orucu mütləq şəkildə haramdır. Qadın günortanın bir saatını qan gördükdə, orucu pozulur.

Qadına Ramazan orucu qəzasının vacibliyinə dəlil, Aişənin (r.a) heyz barədəki: **"Bu hal bizə üz verdikdə orucu qəza etməyi, namazı isə qəza etməməyə əmr olunduq"** hədisidir. Həmçinin, heyz, kəffarət oruclarındakı ardıcıllığı pozmur. Çünki heyz oruca zidd olsa da, heyz olan qadınlar orucdan azad olmurlar. Bunu iyas (heyzdən kəsilmə) yaşına qədər təxir etmək xətərlidir. Burda and kəffarətinin və bənzəri kəffarət orucları istisnadır.[142]

---

[137] Müslim, 1/245,
[138] Müslim, 1/245,
[139] Müslim, 1/244.
[140] Həruriyyə Həruriləra nisbət edilir, mənbəsi Xəvariclərdir. Onlar lazımsız-lazımsız hər şeyi qəlizləşdirirlər.
[141] Buxari, "Əl-Fəth", 1/421; Müslim, 1/265.
[142] "Haşiyətu İbn Abidin", 1/193.

### *Fəcrdən əvvəl heyzin kəsilməsi*

Bir qadın fəcrdən əvvəl təmizləndikdə ona o günün orucu vacibdir.

Gecə heyzdən təmizlənən bir qadın, qüsl etməsə belə, ertəsi günün orucuna niyyət edər, sonra oruclu halda qüsl alacaq. Həmçinin cünub olan qadın da qüsldan əvvəl də vaxt içərisində oruca niyyət edə bilər və orucunu tutar.[143]

### *Fəcrdən sonra heyzin kəsilməsi*

Fəcrdən sonra heyz qanı kəsildikdə, o günki oruc ona sayılmır, lakin qadına onu qəza etməsi vacibdir.

Qadın fərz və nafilə oruca niyyət etdikdən sonra heyz görərsə, o orucunu dərhal pozar və qəza edər. Bu halda oruc tutması haram sayılır.[144]

Bir qadın, Ramazan orucuna niyyətləndikdən sonra gündüzün orucunu istəyərək pozub, daha sonra bir xəstəlik və ya heyz kimi şəri bir üzr gəlsə, o qadının həmin orucu qəza etməsi lazımdır. 60 gun kəffarət orucu tutmaq lazım olmaz.[145]

### *Heyzli qadının oruc nəzir etməsi*

Bir qadın "oruc tutmağa nəzir etmişəm" deyib, o gündə heyz olarsa, bu nəziri doğru olur. Həmin gün oruc tutmasa belə, heyzdən təmizləndikdən sonra ona qəza etmək vacib olur.[146]

### *Oruc kəffarəti arasında heyz fasiləsi*

Bir kəs Ramazan orucunu qəsdən pozarsa, ona günlərin arasını ayırmadan 60 gün kəffarət (cəza) orucu tutmaq vacibdir. Heyz bu orucların davamlığını kəsmiş sayılmaz. Heyzdən təmizləndikdən sonra orucuna yenə davam edər.[147]

Əgər heyzdən sonra bir neçə gün ara verərsə, heyzdən əvvəlki oruclar pozulur və təzədən 60 günü tutmalıdır.[148]

---

[143] İbn Abidin, 1/487-488.
[144] İbn Abidin, 1/475-476; Fətəvayi Hindiyyə", 1/135.
[145] H. Cemal Öğüt, Qadın ilmihalı, 71, 74.
[146] H. Cemal Öğüt, Qadın ilmihalı, 75.
[147] İbn Abidin, 1/475.
[148] H. Cemal Öğüt, Qadın ilmihalı, 74.

***3.Həcc.***

***Həccin qüslları***

Heyzli qadın üçün həccin qüslları sünnətdir. Çünki Aişədən (r.a) rəvayət edilən hədisə görə: **"Məkkəyə heyzli halda gəldim, Kəbəni təvaf, Səfa və Mərvə arasını səy etmədim. Allah Rəsuluna ﷺ şikayət etdim və o belə buyurdu: Təmizlənənə qədər Kəbəni təvaf etməkdən başqa həcc edənlər kimi digər əməlləri yerinə yetir"**[149]. Qadına ihram, Məkkəyə daxil olmaq və Ərəfatda vəqf (qalmaq) üçün qüsl almaq, eləcə də digər sünnət qüslları yerinə yetirmək sünnətdir.

***4.Təvaf.***

Heyzli olan qadın, təvafdan başqa həccin bütün rüknlərini edə bilər. Həccin fərzlərindən olan ziyarət təvafını məcburi olaraq, heyzdən təmizlənənə qədər təxir edər. Lakin bir qadın fərz olan ziyarət təvafını etdikdən sonra heyz olarsa, ondan vəda təvafı düşər. Tərk etdiyi üçün ona bir şey lazım gəlməz.

Yuxarıda qeyd olunan hədisə əsasən, heyzə təvafdan başqa həcc əməllərindən heç biri qadağan deyil.

Məkkəyə girmək üçün qüsl etmək müstəhəbdir. Bu zaman heyzli qadın qüsl edərək girə bilər.

***Qudum təvafı***[150]**.** Bu təvafı etmək sünnətdir, lakin heyzli halda təvaf edərsə, təhrimən məkruh olmasına baxmayaraq, təvafı səhihdir. Çünki təvaf üçün təharət fərz deyil, vacibdir. Vacibi bilərək tərk etmək günah olsa da, əməli batil etmir, lakin kəffarət qurbanı kəsməlidir.[151]

***Ziyarət təvafı.*** Əgər qurban bayramının 1-ci, 2-ci və 3-cü günləri təmizlənərsə, ziyarət təvafını sonraya saxladığına görə ona heç bir şey lazım olmaz.[152]

Eyni zamanda, əgər həccin fərzlərindən olan ziyarət təvafını və ya onun çox hissəsini, qeyd etdiyimiz günlərdə edəcək qədər təmiz olub lakin etməmişsə, gecikdirdiyinə görə ona bir qoyun və ya bir keçi qurban etmək lazımdır. Çünki üzürsüz səbəbə vacibi tərk etmişdir.[153]

Əgər qadın, ehramda ikən adət görməyə başlasa, qüsl edib həccin bütün ayinlərini kişilər kimi edər. Ancaq heyzli ikən ziyarət təvafını etməz (təxir edər, bu təxirə görə də ona qurban və s. lazım deyil).

---

[149] Buxari, "Əl-Fəth", 3/504.

[150] "İfrad həcci" (bir ilin həcc mövsümü içində ümrə etmədən yerinə yetirilən həcdir) edənlərin Məkkəyə daxil olduqları zaman etdikləri ilk təvafdır.

[151] "Umdət-ul Qari", 2/144.

[152] Səmərqəndi, "Tuhfə", 2/ 410, 414.

[153] H. Cemal Öğüt, Qadın ilmihalı, 96.

Təxir etməyə müxtəlif səbəblər mane olursa, məsələn, həcc qruppası gözləməyib getsələr və ya qadının qalmasına başqa səbəblər mane olduğu halda, təvafı da edər, sonra bir dəvəni cərimə olaraq kəsə bilər. Həmçinin tövbə və istiğfar da edər. İmkan tapıb təmizləndikdən sonra bu təvafı yenidən edərsə bu cərimə düşər.[154]

Məkkə əhalisindən olmayıb başqa bir yerdən gələn qadın, həccə gedib ehramdan və Ərəfat vəqfəsindən sonra heyz gördüyünə görə ziyarət təvafını etmədən vətəninə qayıdarsa, onun həcci tamam olmaz.[155]

Bir qadın, bayram günlərində ziyarət təvafını və ya onun çoxunu edə biləcək qədər təmiz olub təvafı tərk edərsə, o qadına cərimə olaraq bir qurban kəsmək lazımdır.

***Vəda təvafı.*** Aişənin (r.a) Safiyə (r.a) heyz ikən Peyğəmbəri ﷺ ona vəda təvafı etmədən getməsini buyurmuşdur. Bu hədisə[156] əsasən heyzli qadına yüngüllük olsun deyə, vəda təvafını etməz. Çünki belə qadına Məscid-ul Harama girmək haramdır.

Ancaq Məkkəni tərk etmədən təmizlənərsə vəda təvafını etməlidir. Məkkə evlərinin səfəri sayılan məsafəni keçdikdən sonra təmizlənərsə, artıq qayıtması lazım deyil. Heyzli olaraq Məkkədən çıxan qadın, miqatı (ehrama girilən yerlər) keçmədən qüsl edib geri qayıdarsa, bu qadın vəda təvafını etməlidir.[157]

### *Həccə gedən qadınlar heyzin qarşısını almaq və ya gecikdirmək üçün dərman içə bilərlərmi?*

Qadınlar həccdə adətli ikən ancaq təvaf edə bilməzlər. Təvafını edə bilmək üçün qanın erkən kəsilməsi və ya adətin gecikməsi üçün bir həkim nəzarəti ilə həb və yaxud başqa dərman istifadə etməsində bir eyib yoxdur.

Həccə gedərkən heyz olmamaq üçün hormonal dərman içmək də caizdir. Lakin tibbi baxımdan belə bir dərmanın zərəri təsdiq olunubsa, həccin əməllərinə zərər gəlməsin deyə, buna təşəbbüs edən günaha girir.[158]

### *5. Quran qiraəti.*

Heyzli qadına Quran qiraəti haramdır.[159] **U**zun ayədən bir az qısa ayə olsa belə, Quran qiraəti haramdır. Bu qiraətə niyyət etdiyi təqdirdədir. Lakin qiraət niyyətilə deyil, həmd-səna və ya zikr məqsədi ilə olsa, eybi yoxdur. Belə ki, Ibn

---

[154] Kəsani, "Bədaiu", 2/129.
[155] Mustafa Uysal, "Multəqa" tərcüməsi, 1/292.
[156] Buxari, "Əl-Fəth", 3/576; Müslim, 2/964.
[157] Celal Yıldırım, "Kaynaklarıyla İslam Fıkhı", 2/344; "Fətəvayi Hindiyyə", 1/128.
**Şafii** məzhəbinə görə bir qadının adətli ikən edəcəyi təvaf heç bir şəkildə keçərli deyil. Təmizləndikdən sonra etməlidir. Nəvəvi, "əl-Məcmu'", 8/ 14, 17.
[158] Halil Gönenç, "Günümüzün meselelerine fetvalar", 2/97.
[159] Tirmizi, 1/236.

Abidin demişdir: **“Əgər Fatihanı dua şəklində və ya dua mənasında olan ayələrdən bir şey oxusa və onu Quran qiraətinə çevirməsə, eybi yoxdur**.”

“Məsəd” surəsi kimi bir surədə dua əks olunmadığına görə, bu surəni oxumaq haramdır.

Heyzli olan müəllimənin Quranı hər iki kəlmədə bir arasını kəsib sözbəsöz öyrətməyi caizdir. Çünki tam oxunmuş cümlə sayılmır. Eyni zamanda, heyzli bir qadının Quranı hərf-hərf hecalamaq və ya kəlmə-kəlmə kəsib oxumaq kərahət deyil, caizdir. Qurandan tilavət etdiyini üzündən köçürüb oxumaq isə məkruh sayılır. Lakin qunut oxumağı və sair zikr və duaları oxumaq məkruh deyil.[160]

Heyzli qadın Qurani-Kərim dinləyə bilər və qəlbindən keçirə də bilər.[161]

### *Mushafa (Qurana) toxunmaq və onu daşımaq*

Heyzli qadının mushafa (Qurana) toxunması haramdır. Çünki Uca Allah buyurur: **“Ona yalnız pak olanlar toxuna bilər!”[162]** Lakin Qurani-Kərimin yanma və ya dənizə, gölə, çaya və s. batma təhlükəsi olduğu zaman, heyzli qadın ona əlini toxundura bilər və Quranı təhlükədən qoruyar. Çünki bu hallar zəruri hallardır.[163]

### *6. Məscidə daxil olmaq.*

Heyzli qadının məsciddə qalmağı haramdır. Həmçinin, etikaf da bura daxildir.[164]

Cünublu kəsdən fərqli olaraq, heyzli qadın vəhşi heyvandan qorxduğu təqdirdə, oğurluq, soyuq və susuzluq kimi zərurət və üzür hallarında, məsciddə qalmadan ordan keçməyi caizdir.[165] Qadına yaxşı olardı ki, təyəmmüm alıb sonra məscidə daxil olsun.[166] Lakin təvaf üçün məscidə daxil olmaq istisnadır.[167]

---

[160] “Fətəvayi-Hindiyyə”, 1/50.

[161] H. Cemal Öğüt, “Qadın ilmihalı”, 80.

**Şafiilərə** görə həmd-səna və ya başqa bir məna ifadə edən bir sözün ayənin bir hissəsində olsa belə, heyzli qadına Quran qiraəti haramdır. Lakin dili hərəkət etdirmədən qəlbdə Quran oxumaq, mushafa (Qurana) baxmaq, orda olanları qəlbindən keçirmək, caizdir. Eləcə də, özünün eşitmədiyi halda dili hərəkət etmək və pıçıldamaq, caizdir. Çünki bunlar Quran qiraəti deyil. Habelə, üzündən köçürdüyünü oxumaq da caizdir.

[162] Vaqiə 56/79.

[163] Mustafa Uysal, “Multəqa” tərcüməsi, 1/61.

[164] Çünki Peyəmbər ﷺ buyurmuşdur: **“Heyzli və cünub olan kəsə məscid halal olmaz”**. Əbu Davud, 1/159.

[165] Dəlili bu ayədir: **“Cünub olduğunuz zaman – yol ötən müsafirlər müstəsnadır...”.** Nisa 4/43.

[166] Kəsani, “Bədai’, 1/38.

[167] **Şafiiyə** görə ehtiyac olmadığı halda, məsciddən keçmək kərahətdir. Ancaq ehtiyac olduğu halda, məscidin xarici yolu qadının evindən uzaq olduğu üçün məscidin yaxın yolundan keçər. “Haşiyətu Əd-Dəsuqi”, 1/173, 174; “Muğn-il muhtəc”, 1/109, 455.

Əgər məsciddə ikən heyz olarsa, çıxmaq üçün təyəmmüm etməsi məndub olur.[168]

Heyzli qadının bayram namazı qılınan yerə (musəllaya) daxil olması caizdir. Həmçinin, cənazə qılınan yer də, məscid hökmündə deyil.[169]

Heyzli və ya cünublu bir kəs qəbir ziyarəti etməsində bir eyib yoxdur.[170]

***7. Cinsi əlaqə.***

Heyzli qadınla cinsi əlaqə haramdır. Çünki Allah-Təala Qurani-Kərimdə buyurur: **"Heyz zamanı qadınlardan kənar olun, (heyzdən) təmizlənməyənə qədər onlarla yaxınlıq etməyin".**[171]

Örtük üstündən qadının göbək və diz aralarından faydalanmaq isə caizdir. İzar (şalvar) altına baxmağı isə məzhəbimiz qadağan etmişdir.[172]

Həmçinin, dizdən faydalanmaq da caiz deyil, çünki diz övrət yerinə daxildir.

***Heyzli qadınla cinsi əlaqənin kəffarəti***

Heyzin əvvəlində cima olduqda, bir dinar[173], axırında olduqda isə yarım dinar sədəqə vermək müstəhəbdir.

Heyzli qadınla bilərək qəsdən cinsi əlaqədə olmaq böyük günahdır. Tövbə etmək lazımdır və yuxarıda qeyd edildiyi kimi, sədəqə vermək məndubdur. Lakin məcbur edilərək və ya unudaraq edilirsə, günah deyildir.

Ancaq bilməyərək heyzli qadınla cinsi münasibətdə olarsa, İslam dininə etiqad edən ölkələrdə dini hökmləri bilməmək, üzür sayılmır. Bir hocadan soruşsun, araşdırsın, öyrənsin.

Heyzli qadınla cinsi əlaqəni caiz görən kəs küfrə düşməz, çünki cinsi əlaqənin heyz vaxtı qadağan olmasının səbəbi heyzdir. Cinsi əlaqənin özü isə, caizdir, lakin ona qadağan heyzə görə gəlmişdir. Ona görə "heyz vaxtı cinsi əlaqə caizdir" deyən kəs küfrə düşmür.[174]

---

168 İbn Abidin, 1/ 477, 478.
169 "əl-Məusuat-ul fiqhiyyə", 5/ 224.
170 Fətavayi Hindiyyə, 1/136-137.
171 Bəqərə 2/222. Peyğəmbərin ﷺ: **"Qadın heyzli ikən onunla cimadan başqa hər şey edin"** hədisi buna dəlildir.
172 **Şafiiyə** görə isə, şəhvətlə olsa belə, baxmaq caizdir. "Əl-Məcmu", 2/ 359; "Muğn-il muhtəc", 1/110.
173 1 dinar, 4,25 qram qızıl edir.
174 **Şafiiyə** görə, heyzli qadınla bilərək edilən cinsi əlaqə, böyük günahdır və bunu caiz görən kəs, küfrə düşür. "Muğn-il muhtəc", 1/110.

Qan 10 günü keçib sonra kəsildiyinə görə, qüslsuz cinsi əlaqə caizdir. Lakin əlaqəni qüsldan sonraya təxir olunması müstəhəbdir.[175]

Mötədə qadına qüsl və ya təyəmmüm edənə qədər yaxınlıq aşağıdakı hallarda caiz deyil:

1) 10 gündən əvvəl və ya adətindən az olan müddətdə;
2) tam adəti müddətində qan kəsildiyi halda;
3) zimmətində namazı borca çevriləcəyi halda (bu, qan kəsildikdən sonra vaxtı ancaq qüsla və təkbir miqdarına çatdığına görədir).

Bu vaxtlar keçdikdən sonra qadın təmiz sayılır. Qüsldan əvvəl olsa belə, zövcü ilə əlaqədə olar.

Adətindən əvvəl və üç gündən artıq vaxtda qan kəsildikdə, adəti üzrə olan heyzi qurtarana qədər, qüsl etsə belə, cinsi əlaqə caiz deyil. Çünki əksər halda adət qayıdır və ehtiyatlı davranıb bu işdən çəkinmək lazımdır.

Əgər adəti 10 gün olan mötədə qadın və adətində üç gün heyz qanı və altı gün təmizlik görsə də (yəni 3 gün qan görüb sonra kəsilsə də, 6 gün təmizlikdə qanı qayıda bilər), ona adəti bitməyənə qədər cinsi əlaqə halal olmaz.[176]

İki cinsi əlaqə arasında dəstəmaz alıb qüsl etmədən, yenidən cinsi münasibətdə olmaq da caizdir. Hamısı üçün bir dəfə qüsl etməsi kifayətdir. Amma arada yuyunmaq və ya dəstəmaz almaq əfzəldir.[177]

Həmçinin, adətli qadınlar əlinə və saçına xına yaxa bilərlər. Onlara nigah da oxuna bilər.

Bundan əlavə, nigah günü qız heyzlidirsə, bunu ərinə bildirməlidir və kişi də heyzin qurtarmasını gözləməlidir. Qız bildirməsə, kişi də gözləməsə, ikisi də məsuliyyət daşıyırlar.[178]

Bir də zifaf gecəsi qızdan müxtəlif səbəblərə görə qızlıq qanı gəlməyə bilər. Bəzi qızlıq pərdələri qalın və elastik olur. Bu səbəbdən qan axma olmaya bilər. Bəzən də, qızlıq pərdəsinin yırtılmasına baxmayaraq, qanama çox olmaya bilər. Çünki hər qadında qızlıq pərdəsinin şəkli, qalınlığı və damar quruluşu fərqlidir. Belə hallarda qızı ittiham etmədən əvvəl ehtiyatlı davranılaraq öncə həkim müayinəsi etdirilsə, ailəvi münasibətlər, bərpası mümkün olmayan yaraların qarşısı alınmış olur.

Qadın adət halını gizlətdiyindən ötrü günahkar olduğu kimi, adəti qurtardığı halda da bitmədiyini söyləməklə də günaha girər. Çünki Peyğəmbər ﷺ: **“Allah müfəssilə qadına lənət etsin. Onu rəhmətindən uzaq salsın”** buyurdu və **“müfəssilə qadına”** belə tərif verdi:

---

[175] **Şafiiyə** görə, qüsl alana qədər cinsi əlaqə halal deyil. “Muğn-il muhtəc”, 1/110; “Əl-Məcmu”, 2/368.

[176] “Haşiyətu İbn Abidin”, 1/195; “Məcmuətu rasəili İbn Abidin”, 1/90.

[177] İbn Abidin, 1/262; “Fətəvayi Hindiyyə”, 1/61.

[178] İbn Abidin, 1/491.

“Müfəssilə, əri onu arzuladığı zaman, adəti başlamadığı halda, “adətliyəm” deyərək ərini aldadan qadındır.”[179]

### *Heyzli qadınla cinsi əlaqə qadağanının səbəb və hikməti*

Heyz qanı, qadının ana rəhmindən gələn qan olub vücuddakı bir çox zəhərlərin süzülməsini və xaricə atılmasını təmin edir. Adət halında qadın yorğun və xəstə olur, bəzən də sancı keçirir.

Adət vaxtında ana rəhminin yolları açıq olduğuna görə, bu qadının az-çox yaralı halı sayılır və ona cinsi yaxınlıq əziyyət verər. Rəhim yollarında passiv və eyni zamanda məkrli mikroblar, oyanaraq bir çox qadınların narahatlığına səbəb ola bilər.

Qadınlar nə qədər təmiz olsalar da, adət halında bəzi qadınlarda ümumiyyətlə ağır qoxu olur. Bu səbəblə həmin vaxtda meydana gələn cinsi yaxınlıq, kişini diksindirə bilər və araya soyuqluq, nifrət girə bilər.

### *8. Talaq.*

### *Heyz vaxtında talağın haram olması*

Bu şəriətin qadağan etdiyi bidət talaqdır.[180] Bu cür talaq, **“Onları gözləmə müddətlərində boşayın”**[181] ayəsinə ziddir. Ayədəki müddət yəni iddəti içində qəsd olunur. Heyz isə, iddətdən hesab edilməyən zamandır, çünki talağın heyz vaxtı baş verməsi qadına iddətinin uzanması baxımından faydalı deyil. Həm də, heyzin qalan günləri iddətdən sayılmaz.

Belə talaqda qadını qaytarmaq vacibdir.

### *Heyzli qadının xulu talağı*

Fiqh alimləri **“Qadının (kəbin haqqından) ərinə bir şey verməsində heç biri üçün günah yoxdur”**[182] ayəsini dəlil gətirməklə, ayrılmaqla qurtulmağa ehtiyac olduğu üçün qarşılığında malından fidyə verərək heyz zamanı xulu talağın caiz olduğunu söyləmişlər.

---

[179] M. Zəvaid, “Əl-Mətalib-ul Aliyyətu”, 4/296.

[180] Dəlili bu hədisdir: “Ibn Ömər (r.a) öz xanımını heyzli ikən boşadı və Ömər (r.a) bunu Peyğəmbərə ﷺ söylədi. **Allah Rəsulu ﷺ belə buyurdu: “Ona əmr et xanımını qaytarsın! Sonra qadın təmizlənib növbəti heyzini görənə və təkrar təmizlənənə qədər onu saxlasın! Ondan sonra artıq istərsə nigahında tutar; istərsə yaxınlıq etmədən boşayar”.** Müslim, 2/1093.

[181] Talaq, 65/1.

[182] Bəqərə, 2/229.

### *Heyz qanının dərman vasitəsilə gəlməsi və kəsilməsi*

Qadın dərman içdiyi halda qan heyz günlərində gələrsə, o, heyzdir və iddətinə sayılacaq. Sonuncu yəni 3-cü heyzidirsə, onunla iddəti tamam olacaq.[183]

### *Heyz iddiası etmək*

**Q**adın heyz olduğunu iddia edirsə, heyz yaşında olduğuna görə bu mümkün olan hal sayılır. Qadına etibar edilir və yalan söyləmiş olsa belə, ona o vaxt cinsi əlaqə haramdır. Bu məsələdə qadının iffətli olmasına və ya doğruluğuna daha çox ehtimal olunur. Amma qadın fasiq olarsa və heyz vaxtında deyilsə, səmimyyətinə şübhə edilir və onun sözü ittifaqən qəbul edilmir.[184]

### *Cünub və heyzli qadın uşağını əmizdirə bilərmi?*

Süd əmizdirən qadın, heyzli ikən uşağını əmizdirə bilər. Cünub ikən də əmizdirə bilsə də, məcbur qalmadıqca əmizdirməməsi daha yaxşıdır. [185] Dəstəmazlı qadının uşağını əmizdirməsi dəstəmazını pozmaz. Dəstəmazlı əmizdirmək daha yaxşıdır.

Dəstəmazı olmayan cünublu və ya heyzli bir qadın zəruri halda su götürmək üçün əlini su qabına salsa, o su isitifadə edilmiş su sayılmaz.[186]

Heyzli qadınlar müəzzinin söylədiyi azanı təkrar edə bilməzlər.[187]

---

[183] "Haşiyətu İbn Abidin", 1/202.
[184] "Haşiyətu İbn Abidin", 1/198.
[185] Halil Gönenç "Günümüzün meselelerinə fetvalar", 2/31.
[186] "Fətəvayi Hindiyyə", 1/81.
[187] Cemal Öğüt "Kadın ilmihalı", 86.

## *II - İstihazə*

***Tərifi:***

İstihazə (üzr qanı): **“Ana rəhmindən deyil, bir damardan gəlib tənasül üzvü vasitəsilə axan qoxusuz qandır”.**[188] Istihazə qanı, qadında hormonal bir pozğunluğun və ya müəyyən bir cinsiyyət orqanı xəstəliyinin nəticəsində gələn tərli, ifrazatlı qanaxmadır. Istihazə qanının rəngi, açıq qırmızıdır və qoxusu olmur. Həmçinin, istihazənin müəyyən bir vaxtı da yoxdur.

Aşağıdakı hallada gələn qan istihazədir:

**1-** Ən az heyz görmə yaşından (9 yaş) əvvəl gələn qan;
**2-** Heyz görən bir qadından 3 gündən az bir vaxtda gələn qan;
**3-** Heyz görən bir qadından 10 gündən daha çox müddətdə gələn qan;
**4-** Heyzli qadın adətindən sonra 15 gün təmizlik görmədən gələn qan;
**5-** Hamilə qadınlarda görülən qan;
**6-** Nifaslı qadının 40 gündən artıq gördüyü qan;
**7-** Heyzdən kəsilmə (klimaks) yaşından sonra gələn qan.

### *Istihazə ilə bağlı məsələlər*

Yuxarıda qeyd etdiyimiz kimi, istihazə qanı açıq qırmızı rəngdə olub qoxusu yoxdur. Hənəfi alimı Birkivi istihazə barədə belə demişdir: **“İstihazə, burun qan axması kimi ən kiçik təharət pozulmasıdır. Onunla namaz düşməz, çünki üzr halı üçün rüxsət (güzəşt) yolu olduğuna görə, namazın səhihliyinə mane deyil. Fərz və ya nafilə orucu tutmaq haram olmaz. Hamnə bint Cəhşdən rəvayət olunan hədisə görə, istihazə, cimaya yəni cinsi əlaqəyə mane olmaz. Həmin hədisdə nəql olunur ki, Hamnə bint Cəhş istihazəli ikən əri ilə cinsi yaxınlıqda oldu”.**

Eləcə də, Quran oxumağa, mushafa (Qurana) toxunmağa, məscidə daxil olmağa və təvaf etməyə maneçiliyi yoxdur. Istihazəli qadının halı, daimi axan burun qanaxması hökmündə olduğuna görə o, namaz və orucunu yerinə yetirər.[189]

Bütün bunların dəlili bu hədisdir: “Bir qadın Peyğəmbərə ﷺ gələrək: “Mən istihazəli bir qadınam, təmiz qala bilmirəm, namazı tərk edimmi? – deyə soruşdu. Allah Rəsulu ﷺ belə buyurdu: **“Xeyir, adət günlərində namazdan uzaq dur, sonra qüsl et və hər namaz üçün dəstəmaz al. Qan həsir üzərinə damsa belə, namazını qıl.”**[190]

---

[188] “Ğurər və Durər”, 1/174.
[189] “Məcmuətu rasəili İbn Abidin”, 1/114; “Haşiyətu Radd-ul-muhtər alə sadr-il-muxtər”, 1/198; “Fəth-ul qadir”, 1/156.
[190] Əbu Davud, Təharət, 112, 115; Tirmizi, Təharət, 94.

### *Üzürlü sayılmanın şərtləri*

Fiqh alimləri istihazəli və digər üzrü olan qadınlar üçün üç şərt qeyd etmişdirlər:

1. Bir fərz namazın tam vaxtı çıxana qədər üzr qanı davam edərsə, qadının üzərindən üzrlü olma hökmü düşməz. Eləcə də, təharətinə və namazına sərf olunan vaxt qədər zaman qalmasa, ancaq onda qadın üzr sahibi olur.
2. Üzrün bir dəfə də olsa, isbatlandığı ilk vaxtdan başqa, digər vaxtda da mövcud olmasıdır.
3. Üzür qanı kəsildiyi vaxtdan qadın üzrlü yəni istihazəli haldan çıxar. Yəni qan kəsilməsi, namazın tam vaxtı davam etdiyinə görə, belə halda olan qadın, sağlam qadınların hökmündə olar.[191]

İstihazəli qadın, hər fərz namazın vaxtı üçün dəstəmaz alır və o vaxtın fərz və nafilə namazlarını qılar. Məzhəbimizə görə, üzürlü qadının dəstəmazı, vaxtın çıxmasıyla pozulur.[192]

### *Istihazəli qadının əhkamları*

Istihazə qanı, burundan daim axan qan və ya sidik qaçırması kimidir. Fiqhdə istihazəli qadının xüsusi əhkamları var. Onlar sağlam qadınların əhkamlarından, həmçinin, heyz və nifasın əhkamlarından da fərqlənir.

Qadın istihazə qanından necə qorunmalı və ya tamamilə qorunmaq çətinləşdikdə, bu işi necə asanlaşdırmaq olar?

Bunun üçün ayaq üstə və ya oturaraq pambıq qoyulur və ya qadınların bildiyi gigiyenik qorunma vasitələri (bezlər) istifadə olunur.

Əgər istihazə qanı başqa vaxt axmayıb səcdə əsnasında axarsa, qiyam və ya quudu (oturuşu) işarətlə əda etsin. Eləcə də, qiyam zamanı qan axarsa, oturan yerdə namaz qılsın. Çünki səcdəni, qiyamı və ya quudu tərk etmək, hədəsli (dəstəmazsızlıq halı) namaz qılmaqdan daha asandır.

Həmçinin, istihazəli qadın, qanın axmasını (tampon) tıxama ilə də qarşısını ala bilər. Əgər tampon islanarsa və ya axıntı çölə çıxarsa, dəstəmazı pozulur.

Istihazəli qadında üzür qanı yuxarıda qeyd olunmuş və ya ona bənzər səbəblərdən əngəllənsə, üzr sahibi olmaqdan çıxar.[193]

### *Istihazə qanının geyim üzərinə axmasının hökmü*

Geyimə ovuc dərinliyi və ondan daha çox miqdar qana batdıqda, o yeri yumaq vacibdir. Çünki təkrar batmasın deyə yumaqda fayda var. Lakin yumayıb namaz qılsa, caiz olmaz.

---

[191] “Məraq-il fəlah” və “Haşiyətu Tahtavi”, s.81.

[192] “Ğurər və Durər”, 1/84.

[193] “Haşiyətu radd-ul muxtər aləd-dəril-muxtər”, 1/204; Tahtavi “Məraq-il fələh”, s.80.

Əgər yumaq faydasızdırsa, üzrü olduğu müddətcə, yumaq vacib deyil.[194] Yəni paltarı yusa belə, namazı bitirməzdən əvvəl ikinci dəfə nəcisətə batarsa, yumaması caizdir.[195]

## *İstihazəli qadının halları*

1. İstihazə halı başlamadan əvvəl, heyz müddəti müəyyən olunur. Yəni adət müddətindən əlavə günlər istihazə günləridir.
2. Qanın axması, ardıcıl olaraq davam etmişdir. Bu səbəblə qadının adət müddəti məlum olmamışdır. Ona görə öz adət qanını ayırd edə bilmir. Bu halda qadının adət vaxtı 6 və ya 7 gün sayılır. Qalan 23 gün və gecəsi və ya 24 gün və gecəsi namazını qılar.
3. Qadının müəyyən bir adəti yoxdur. Lakin adət qanıyla digər qanları ayırd edə bilir. Bu halda qadın, qanı ayırd etməsinə görə əməl edər. Tünd qırmızı, qaraya yaxın rəngdə axan qan adət qanıdır. Belə qan davam edən günlər namaz qılmaz, oruc tutmaz. Qanın rəngi dəyişdikdə, istihazə qanı başladığına hökm edər. Qüsl edib namaza başlar.[196]

***Mübtədəa*** qadında maksimal heyz müddətindən (10 gündən) artıq gördüyü qan istihazədir.[197]

***Mötədə*** qadında isə, adətindən artıq olan qan günləri istihazədir. Qadının bəlli bir adəti varsa, o müddət götürülür. Yəni adətindən əlavə gələn qan, xəstəlik (üzr) qanıdır.[198]

Bir qadının hamilə ikən doğum edəcəyi vaxt və ya doğumdan əvvəl gördüyü qan, istihazə qanıdır.[199]

***Mutahayyirə***, qanın davamlı gəlməsindən sonra adətini unudan, həmçinin, adətində çaşqınlığa düşən qadındır.[200]

***Mutahayyirə,*** yəni adətini unudan qadının məsələsi heyzin ən çətin və ən dəqiq məsələlərindən biridir. Onun çoxlu halları var. Buna görə qadına vacibdir ki, adətinin vaxtını və gün sayını yadda saxlasın.

---

[194] "Əl-Bədaiu", 1/147; "Haşiyətu Raddul muhtər aləd-dəril muxtər", 1/204.

[195] **Şafiiyə** görə, qadın qorunduğu təqdirdə, namazda geydiyi xüsusi paltarı kirlənsə belə, qanın xaric olması zərər verməz. "Haşiyətu əl-Qalyubi", 1/101.

[196] Celal Yıldırım, "Kaynaklarıyla ahkam hadisleri", 1/403.

[197] **Şafiiyə** görə, qanını ayırd edən mübtədəa qadında qan, minimal heyz vaxtından az və maksimal heyz vaxtından çox deyilsə, gördüyü qara və ya gur qan, heyz qanıdır. Qan, ən çox heyz müddətini keçib davam edərsə, gördüyü zəif və ya qırmızı qan, istihazə qanıdır. "Muğn-il muhtəc", 1/113; "Əl-Məcmu", 2/412.

[198] İbn Abidin, 1/463, 499.

**Şafiiyə** görə, adəti ilə deyil, təmyizinə görə hökm edilir. Əgər mötədə qadının adəti, hər ayın əvvəlindən beş gündürsə, təmizlik günlərində istihazə olar. Sonra ayın başından on gün qara qan və qalan günlər qırmızı qan görərsə, onun heyzi qara qan axan on gün, ardından olan günlər isə, istihazədir. "Muğn-il muhtəc", 1/115.

[199] "Fətəvayi Hindiyyə", 1/134.

[200] "Tahtavi", 1/76.

Bu məsələ haqqında bütün hökmlər ehtiyat üzərində qurulur. Belə hallarda olan qadınlar qadağan olunanlardan çəkinməlidir.

### *Istihazəli qadının dəstəmazı və ibadəti*

İstihazəli və bənzəri halda olan üzürlü qadın, hər fərz namaz vaxtı üçün dəstəmaz alır və üzürlü vaxtda fərz,[201] nəzir, nafilə namazlarını, vitr, bayram və cənazə namazları kimi vacib namazları qılar. Eləcə də, yuxarıda qeyd etdiyimiz kimi, təvaf və mushafa (Qurana) toxunmaq[202] kimi əməlləri edər.

Istihazəli qadında dəstəmazın hansı hallarda pozulmasını Imam Əbu Hanifə belə açıqlamışdır:

**"- Qanı kəsilıb dəstəmaz alarsa, sonra yenə qanı axarsa, dəstəmaz pozulur.**

**- Əgər üzrün kəsildiyi müddətdə başqa hədəsdən yəni başqa üzrə görə dəstəmaz alarsa, sonra qan axarsa, dəstəmaz pozulur.**

**- Əgər qan üzründən dəstəmaz alıb sonra başqa bir hədəs baş verərsə, yenə dəstəmaz pozulur. Məsələn, daim axıntı olduğu halda dəstəmaz alarsa, sonra sidiyə getməklə hədəsli olarsa, dəstəmaz pozulur".**[203]

İstihazə qanı davam edib sonra heyzi başlayarsa və öz halını ayırd edə bilirsə, o zaman namazı tərk edər. Ramazan ayında heyz müddəti oruc tutmaz və cinsi əlaqədə olmaz. Vaxtı qurtardıqda bir dəfə qüsl edər, sonra isə hər namaz üçün dəstəmaz alar. İstihazəli qadın, dəstəmaz almadan əvvəl cinsiyyət üzvünü yuyar və təmiz bir bezlə və ya gigiyenik vasitələrlə özünü qoruyar.[204]

---

[201] "Əl-Bədaiu", 1/143; "Haşiyətu radd-ul muhtər alə dər-il-muxtər", 1/203; "Əl-Hətab", 1/318.
[202] "Tahtavi alə məraq-il fələh", s.80.
[203] "Haşiyətu Radd-ul muhtər alə dər-il muxtər", 1/204; "Əl-Muğni məaş-şərh-il kəbir", 1/379.
[204] Celal Yıldırım, "Kaynaklarla ahkam hadisleri", 1/396.
**Şafiiyə** görə, istihazəli qadının dəstəmazı, namazlarını (fərz və nafilə) bitirdikdən sonra pozulur. "Əl-Məcmu li İmam Nəvəvi", 2/541.

# *III - Nifas*

***Tərifi:***

Nifas, lüğətdə "hamiləlik bitdikdə qadının doğum etməsi", "ana rəhminin uşaqla nəfəs alması" deməkdir. Belə qadınlar nifaslı qadınlar adlanır. Eləcə də, bir qadının hamiləlik vaxtı bətnindəkini düşürdükdən sonra və ya abortdan sonra qanaxmasının davam etdiyi hal da, nifas halıdır.

Hənəfi fəqihləri, nifası termin olaraq "doğumdan sonra xaric olan qan" kimi tərif vermişlər.

### *Nifasın müddəti*

***Minimal nifas müddəti:***

Fiqh alimləri ən az nifas müddətinin həddi olmadığını söyləmişlər, hansı vaxt təmizliyini gördükdə qüsl edib namazını qılar.[205]

Hər qadının fərqli nifas müddəti ola bilər. Bu, qadının fiziki quruluşuna, orqanizminə və mühit şərtlərinə görə dəyişir.

***Maksimal nifas müddəti:***

Məzhəbimizə görə, maksimal nifas müddəti, 40 gündür.

Nifas qanı qırx gündən artıq gəlib heyz adət ilə eyni vaxta düşərsə, o heyzdir. Lakin həmin vaxta rastlamazsa, o istihazədir.

### *Nifasın başlanğıcı*

Fəqihlər söyləmişlər ki, uşaq doğulmadan əvvəl doğum başladığı vaxt və ya doğuş ərzində hamilə qadının gördüyü qan istihazə qanıdır. Hətta, doğum halı uzansa belə, axan qan nifas qanı deyil.[206]

### *Nifas müddətində qanın kəsilməsi*

Fiqh alimləri nifas müddətindən yəni 40 gündən əvvəl qanın kəsilməsinin iki halı olur:

***1) Qanın qayıtmadan tamamilə kəsilməsi.***

Nifaslı qadının 40 gündən əvvəl qanı kəsilərsə, nifası tam bitib təmizlənmişdir. O, qüsl alaraq namazını və digər ibadətlərini yerinə yetirər.[207]

***2) Kəsilən qanın nifas müddətində qayıtması.***

---

[205] "Fəth-ul Qadir", 1/166; "Bədəius sanəi", 1/41.

**Şafiiyə** görə, nifasın ən az müddəti bir andır. Ən çox müddət isə, 60 gündür. "Raudat-ut Talibin", 1/174; "Muğnil muhtəc", 1/119.

[206] "Fəth-ul Qadir", 1/164.

**Şafiiyə** görə, doğumdan əvvəl hamilə qadının gördüyü qan, nifas deyil, heyzdir. Lakin nifas müddəti, heyz qanı gördüyü vaxtdan deyil, uşağın xaric olması və doğulması anından hesablanır. "Raudatut Talibin", 1/174, 175; "Muğnil muhtəc", 1/119.

[207] "Bədəius sanəi", 1/172.

Qan kəsilən müddətin 15 gündən az və ya çox olmasına gəlincə, İmam Əbu Hənifə (r) 40 günün arasındakı təmizlik fasiləsinin nifas müddətindən sayıldığı görüşündədir. Fətva da bunun üzərinədir.[208]

İlk dəfə nifas olan qadının qanı 30 gün sonra kəsilib sonra 45 gün tamam olmadan yenə qan görsə, bunun 40 günü nifasdır. Çünki heyzlə nifas arasındakı təmizlik müddəti 15 gün olmamışdır. Aradakı fasilədən sonra gördüyü ikinci qan, istihazədir. Belə hallarda nifasın müddəti 40 gün sayılır.[209]

Nifaslı bir qadının, məsələn, hər dəfəki nifas adəti 40 gün olduğu halda, bir nifasında isə, 20 gün qan görüb kəsilsə, sonra 19 gün təmiz qalsa, əvvəlki adəti olan 40 gün bitmədikcə əriylə cinsi əlaqədə ola bilməz.[210]

***40 günü keçməməklə, nifas adətindən əlavə qan görən qadına aid misal.***

1) Nifas adəti 20 gün ikən 15 gündə qan kəsilsə, adəti 15 gün olur.
2) Qan 25 gün davam etsə, adəti 25 gün olur.[211]

Qadının heyzdə olduğu kimi, nifasda da bir adəti vardır. Yəni bir neçə dəfə doğan qadının nifas adəti ilk doğumuna görə müəyyən olunur.

Lakin ikinci doğumda 40 günü keçməmək şərtiylə ilk doğumun nifasından daha çox və ya az müddət ola bilər. Bu halda, nifas adəti dəyişir.

Normal nifas adəti görən qadın, ikinci doğumda 40 gündən artıq qan görərsə, nifas müddəti ilk doğumdakı qədərdir, əlavə günlər isə, istihazədir.

### *Əkiz uşaqların doğumunda nifas*

Əkiz doğan qadın, ilk uşağı doğduğu vaxtdan etibarən nifaslıdır. Əkizlikdə şərt iki uşaq arasındakı müddətin altı aydan az olmasıdır. Səhih olan əkizlik şərti, hamiləliyin bir olmasıdır.[212]

Qadının nifaslı olması üçün, uşağın yarısından çoxunun xaricə çıxması lazımdır.[213]

İmam Əbu Hənifə və İmam Əbu Yusifə görə, qadının nifası birinci uşaqdan sonradır. Hətta birinci uşağın doğumundan sonra qan davamlı olub çoxalsa da, nifas qırx gündür. Qırx gündən sonra, ikinci uşağın ardından gələn qan isə istihazə qanıdır.[214]

---

208 "Fətəvayi-Hindiyyə", 1/133.
**Şafiiyə** görə, nifas qanı ilə heyz qanı arasında arasındakı təmizlik üçün müəyyən bir müddət yoxdur. Yəni 60 günlük nifas qanı kəsildikdən sonra qan təkrar gələrsə, yeni axan qan, heyz qanıdır. Aralarında 15 gün keçməsi gərək deyil. "Muğnil Muhtəc", 1/119.
209 Cemal Öğüt, «Kadın ilmihalı", 132.
210 Cemal Öğüt, «Kadın ilmihalı", 133.
211 "Fətəvayi Hindiyyə", 1/140.
212 "Fətəvayi Hindiyyə", 1/133; İbn Abidin, 1/498.
213 "Fətəvayi Hindiyyə", 1/132.
214 "Fəth-ul Qadir", 1/167.
**Şafiiyə** görə, hər iki uşaqdan sonra görülən nifas qanları, ilk uşağın doğulmasından başlayıb bir nifas müddəti edir. Nifas qanlarının cəmi, altmış gündən çox olarsa, artıq olan istihazədir.

Qadının nifas adəti 40 gün olub, ilk uşaqdan sonra iyirmi gün, ikincidən sonra isə iyirmi bir gün qan görərsə, İmam Əbu Hənifə və İmam Əbu Yusifə görə, ilk 20 gün nifasdır, ikinci uşaqdan sonra gələn isə, istihazə qanıdır.

Əgər qadın üç uşaq (üçəm) dünyaya gətirərsə, ilk uşaqla 2-ci, eləcə də 2-ci ilə 3-cünün arasındakı müddət, 6 aydan az olur. Lakin 1-ci ilə 3-cünün arasındakı müddət 6 aydan çoxdur. Üçəmlikdə də səhih olan şərt, bir hamiləliyin olmasıdır.[215]

### *Doğumdan sonra qan görməyən qadın nifaslı sayılırmı?*

Doğumdan sonra qan görməyən qadınların nifas halı ilə bağlı məzhəb imamları arasında fərqli görüşlər olsa da, alimlərin çoxu İmam Əbu Hənifənin (r) görüşünü götürmüşlər. İmama görə, belə qadın nifaslıdır və ehtiyata əsasən ona qüsl lazımdır.[216]

Doğum göbəkdən yəni qeysəriyyə əməliyyatı ilə baş verərsə, qan da göbəkdən axar. Cərrahi yolla doğum edən qadın nifaslı olmaz, yaralı sayılır. Lakin qan ana rəhmindən gələrsə, nifaslıdır. Çünki doğumdan sonra qan rəhimdən çıxmışdır.[217]

### *Uşaq düşməsiylə (siqtlə) bağlı nifasın hökmü*

Uşağın barmaq, dırnaq və saç kimi üzvlərin formalaşdığı halda ana rəhmindən düşmüşsə, qadın nifaslı sayılır. Çünki bu insan yaradılışının başlanğıc mərhələsidir.

Həmçinin, uşaq bətndən parçalanmış və ya çox hissəsi çıxdığı halda da, qadın nifaslıdır.[218]

Düşən uşaqdan bir şey aşkar olmadığı halda, qadın nifaslı sayılmaz.[219]

Bir qadın, uşaq düşməsindən əvvəl və sonra qan görüb bədən üzvləri də bəlli olursa, onun əvvəl gördüyü qan, heyz qanı deyil. Düşmədən sonra qan gördüyü üçün o qadın nifaslı sayılır. Lakin düşmədə bədən üzvləri görünmürsə, əvvəl gördüyü qan, qadını heyzli saymaq mümkün olduğu halda, o, heyz qanıdır.[220]

Üzvü bəlli olmayan uşağı düşürən qadından 3 gün qan davam edib və ondan əvvəl olan heyzindən sonra tam bir təmizlik müddəti keçərsə, heyizdir. Çünki iki heyz arasından 15 gün keçməlidir.

Uşağı düşən qadında aşağıdakı hallarda gördüyü qan istihazə qanı sayılır:

---

Altmış günü keçdikdən sonra ikinci uşaq yəni əkiz tayı doğularsa, ardından görülən qan istihazə qanıdır. "Əl-Məcmu", 2/526.

[215] "Bəhr-ur raiq", 1/231.

[216] "Fəthul Qadir", 1/164; "Haşiyətu ət-Tahtavi alə Məraqil Fələh", s.75.

[217] "Haşiyətu ət-Tahtavi alə Məraqil Fələh", s.75; İbn Abidin, 1/494.

[218] "Fəth-ul Qadir", 1/165; "Fətəvayi Hindiyyə", 1/132.

[219] "Əl-İnəyətu bi həmiş Fəth-ul Qadir", 1/165.

[220] "Fətəvayi Hindiyyə", 1/132.

1. Qan 3 gün davam etməz, lakin ondan əvvəl 15 gün təmizlik müddəti görmüşdür;
2. Qanı 3 gün davam edər, ondan əvvəl isə, 15 gün təmizlik müddəti keçməmişdir;
3. Qanı həm 3 gün davam etməz, həm də əvvəldən 15 gün təmizlik müddəti keçməmişdir.[221]

### *Düşən uşağın üzvləri bəlli olmayan qadının halına aid misal*

Heyzi 10 gün, təmizlik müddəti 20 gün, nifas da 40 gündürsə, uşağı heyzin ilk günündə düşürən qadın nə edər?

1. 10 gün namazını tərk edər. Bu qadın heyizli də, nifaslı da ola bilər.
2. Sonra qüsl edib 20 gün namazını şübhə ilə qılar. Çünki nifaslı və ya təmiz olması ehtimalı vardır.
3. Bundan sonra da 10 gün namazını tərk edər. Çünki ya heyizlidir, ya da nifaslıdır.
4. Daha sonra qüsl edərək 20 gün tam yəqinliklə namazını qılar.

Bu 40 günü tamamlamaq üçündür. Ondan sonra adəti 10 gün heyz, 20 gün təmizlik müddəti olur.

Uşağı heyz günlərindən sonra düşürən qadın isə, nə edər?

1. O vaxtdan etibarən təmizlik müddətindəki adəti qədər şübhə ilə namazını qılar.
2. Sonra heyzdəki bildiyi adəti qədər namazını tərk edər.

Qadının heyzi kəsilməklə hamiləlik günlərinin sayını bilməzsə, 120 gün qan görməyib sonra uşağı düşərsə, uşağın üzvləri bəlli sayılır.[222]

Dölün üzvləri ancaq 120 gündə bəlli olduğuna görə qadın onunla nifaslı sayılır.

Dölün heç bir üzvü görünmürsə, o bir şey sayılmaz. Qadından gələn qan 3 gün davam edib sonra 15 gün təmizlik müddəti keçərsə, o, heyizlidir. Əgər olmazsa, istihazədir.[223]

### *Ana bətnində ölən və düşük olan uşaqlar üçün edilən dini vacibatlar*

Bunlar aşağıdakılardır:

Ölü doğulan uşağın adı qoyulur, yuyulub bir bez parçaya bükülür və cənazə namazı qılınmadan dəfn edilir. Sağ doğulub sonra ölən uşağın isə adı qoyulur, yuyulub kəfənlənir və namazı qılınır. Hənəfi alimi Əl-Kəsəni İmam Əbu Yusifdən nəql edərək demişdir:**“Ölü olaraq doğulan uşaq yuyulur və ona ad qoyulur. Lakin cənazə namazı qılınmır.”**[224]

---

[221] İbn Abidin, 1/504.
[222] İbn Abidin, 1/504.
[223] Halil Gönenç, “Günümüz meselelerine fetvalar”, 2/171.
[224] “Bədai-us-Sanəi”, 1/302.

Düşən uşaqlarda səs, nəfəs, hərəkət kimi həyat əlaməti aşkar edilərsə, yuyulması vacibdir. Eləcə də bədən üzvləri tam formalaşmış, ölü doğulan körpə də yuyulur. Üzvləri tam formalaşmamış düşən döllər isə, yuyulmaz. Bir bez parçaya bükülüb ad qoyulmadan dəfn edilir. Cənazə namazı da qılınmaz.

Uşaq, doğumdan sonra bir səs çıxarıb ölərsə yəni doğulduqda canlı olub sonra ölərsə, ad qoyulur, yuyulur və cənazə namazı qılınır. Heç həyat əlaməti olmayıb, yəni ölü halda doğulsa da, ad qoyulur, yuyulur və bir bez parçasına bükülür, lakin cənazə namazı qılınmadan dəfn edilir.[225]

Böyüklərin qəbrində olduğu kimi, uşağın da qəbrinin tanınması üçün baş və ayaq tərəflərinə daş qoyulmalıdır. Əqiqə qurbanı kəsmək lazım deyil.

[225] Vahbət Zuhəyli, "İslam Fiqhi", 3/60.

# *IV - İyas (klimaks)*

***Tərifi***

**"Iyas",** bir şeydən ümidsiz olmaq, "əl-yəis" isə ümidini itirmək, arzunun boşa çıxması deməkdir. Əlli və ya əlli beş yaşında qadına "yəisə" və ya "ayisə" deyilir.

"Iyas", qadının həyatında bir dövrdür, həmin dövrdə qadın orqanizmində baş verən dəyişikliklərə görə heyz və döllənmə prosesləri kəsilir.

Heyzdən kəsilmə bədən orqanlarının funksiyalarında pozğunluqlarla, həmçinin əsəb pozğunluğu ilə müşayiət olunur.

### *Iyasın yaşı*

Həkimlər, qadında döllənmə qabiliyyətinin həddi-büluğ çağından sonra 35 il davam etdiyini və bundan sonra döllənmə və doğum qabiliyyətinin dayandığını müəyyən etmişlər.

İyas halı üçün yaş həddini əlli beş yaş təyin etmişlər. Əksər alimlər (Buxara, Xarəzm və Mərv alimləri) bununla fətva vermişlərdir.[226]

### *Iyas halı başlamadan əvvəl bir müddət qanın kəsilməsi şərti*

Bu şərt, 50 və ya 55 iyas yaşı baxımından söylənmişdir. Fəqihlər bu yaş dövründə iyas barəsində hökm etmək üçün qanın qadından uzun bir müddətə kəsilməsini şərt qoymuşlar. Həmin müddət, daha səhih görüşə görə altı aydır. Lakin daha doğru olanı, iyas yaşından sonra bu şərti qoymamaqdır. Çünki qan iyas yaşından (50 və ya 55 yaş) əvvəl kəsilsə, demək qadın daha erkən iyasa daxil olmuşdur. Belə qadını əri boşadıqda onun iyaslı olmasına qərar verib boşamışdır. Qadın da üç ay iddət gözləyər.[227]

### *Heyz olmayan qadının iyas halı*

Fəqihlər demişlər ki, qadın müəyyən yaşa çatıb və heç heyz halı görməmişsə, 30 yaşına çatdığı zaman onun heyzi kəsilmiş sayılır yəni iyaslı (ayisə) olmasına qərar verilir. Bu barədə "Əl-Bəhr" kitabında "Cəmi'us-sağir"dən nəql olunmuşdur.[228]

---

[226] M. Məvqufati, "Məvqufat" (tərc, A. Davudoğlu), 1/79-80; Molla Xüsrəv, "Ğurər və Dürər", (tərc. Arif Erkan), 1/82.
İmam Şafii, iyasın təyinində müəyyən bir yaş yerinə qohum qadınların vəziyyətini diqqətə almasını əsas almışdır. Şafii, "əl-Um", 4/214.
[227] "Haşiyətu İbn Abidin", 2/607.
[228] "İbn Abidin", 2/602, 606.

### *Yəisə qadının talaq iddəti*

Bildiyimiz kimi, talağı verilən qadının iddəti üç quru’dur (3 heyzdir)[229]. Hamilə qadının iddəti isə övladını dünyaya gətirməsinə qədərdir.

Heyzdən kəsilən yaisə qadına gəlincə isə, onun iddəti talaq günündən etibarən üç aydır. Bu məsələdə ittifaq edilmişdir.[230] Dəlili isə, bu ayədir:

**“**(Yaşa dolmaqla) **heyzdən kəsilmiş qadınlarınız** (onların gözləmə müddəti) **barədə şübhə etsəniz, (bilin ki) onların gözləmə müddəti üç aydır”.**[231]

### *Yəisə qadının geyimi*

İyas yaşındakı bir qadın nigah qurmağa ümidi kəsilər. Ona tam örtünmə məsələsində bir növ rüxsət tanınır. Belə ki, Uca Allah buyurur:

**“**(Heyzdən və doğuşdan kəsildikləri üçün) **ərə getməyə ümidi qalmayan yaşlı qadınların qadağan olunmuş zinətlərini** (zinət yerlərini naməhrəmə) **göstərmədən üst paltarını** (çarşab, niqab, büründək və s.) **çıxarmasında günah yoxdur.”**[232]

Yuxarıda qeyd olunan “ən-Nur” surəsinin 60-cı ayəsindən göründüyü kimi, heyzdən kəsilmiş yəni uşaq doğmağa ümidi qalmamış qadınların üst geyimini çıxarmaqlarında bir eyib yoxdur. Ayədəki “üst geyim” ifadəsi cilbab və ya rida şəkilində açıqlanmışdır. Əbu Həyyan əl-Əndəlusi isə, cilbabın qadını pis nəzərlərdən qorumasını təmin edən bir geyim olduğunu söyləmişdir.[233]

---

[229] Şafii məzhəbinə görə, 3 təmizlik müddətidir.
[230] “İbn Abidin”, 2/602.
[231] Talaq 65/4.
[232] Nur 24/60.
[233] “ən-Nəhr-ul mə’d”, 4/ 536.

# Beşinci fəsil

# Qadınların təsəttürü

- **Örtünmə**
- **Qadının örtünməsində lazım olan keyfiyyətlər**
- **Müsəlman bir qadın kimlərin yanında və necə örtünməli?**
- **Geyimdə haram və məkruh olanlar**

## *I - Örtünmə*

“Təsəttür”, ərəb sözü olub, lüğətdə örtünmək, gizlənmək, bir şeyin içində və ya arxasında gizlənmək mənalarında gəlmişdir. Fiqh termini olaraq isə, “kişi və ya qadının şər’ən örtünməsi lazım olan yerlərini örtməsi” deməkdir. Bir kəsin örtməsi fərz olan və başqasının baxması haram olan yerlərinə “övrət yeri” deyilir. Evlənmələri caiz olan kişi və qadının bir-birinin yanında olan zaman övrət yerlərini örtməsinin vacibliyi məsələsində fəqihlərin icması var. Səhih görüşə görə, bir kəs təkbaşına olduğu zaman da örtünməlidir. Buna görə, bir şəxsin təmiz geyimi olduğu halda, heç kəsin olmadığı bir otaqda çılpaq şəkildə qılacağı namaz səhih olmaz.[234]

Allah-Təalanın Qurani-Kərimdə qadınların örtünməsiylə bağlı nə buyurduğuna nəzər salaq: **“Mö’min qadınlara de ki, gözlərini** (harama baxmaqdan) **çevirsinlər və ayıb yerlərini** (zinadan) **qorusunlar**. **Öz-özlüyündən görünən qisimlər istisna olmaqla, zinətlərini göstərməsinlər. Baş örtüklərini yaxalarının üstünə örtsünlər. Zinətlərini ərləri, ataları, ərlərinin ataları, oğulları, ərlərinin oğulları, qardaşları, yaxud qardaşlarının oğulları, bacılarının oğulları, öz qadınları** (mömin qadınlar)**, sahib olduqları cariyələr, kişiliyi qalmamış xidmətçilər, yaxud qadınların məhrəm yerlərinin fərqində olmayan uşaqlardan başqasına göstərməsinlər! Gizlətdikləri zinətlər bilinsin deyə ayaqlarını yerə vurmasınlar! Ey mö’minlər, hamılıqla Allaha tövbə edin ki, nicat tapasınız!”**[235]

Ayədəki zinətlər barəsində təfsir alimi İbn Kəsir belə yazır: “**“Baş örtüklərini yaxalarının üstünə örtsünlər”** yəni qadınlar üçün hazırlanan və ucları geniş olan baş örtükləri –məqnələr[236] nəzərdə tutulur. Bunlar, cahiliyyə dövrü qadınlarının adət və görünüşlərindən fərqli olsun deyə, sinə və boyunlarını örtməklə qadınların sinələri üzərinə qoyulur. Cahiliyyə dövrü qadınları belə etməzdilər. Əksinə qadın, kişilər arasında sinəsi açıq olaraq gəzir, köksünü hər hansı bir şeylə örtməzdi. Bəzən boynunu, saç hörüklərini və qulaqlarındakı sırğaları da açıq qoyardı. Allah-Təala mömin qadınlara həm görünüşləri, həm də hallarıyla örtünüb gizlənmələrini əmr etmişdir.

Ayədəki baş örtükləri mənasında işlənən “xumur” sözünün təki “ximar” olub, lüğətdə qadının onunla başını örtdüyü şey deməkdir. Səid bin Cübeyr (ö/713) ayənin bu hissəsini belə açıqlayır: “Baş örtükləriylə sinə və boyunlarının üzərinə örtüb bağlasınlar ki, bunlardan heç bir yeri görünməsin.[237]

---

[234] İbn Abidin, “Raddul-muxtər”, 1/375.
[235] Nur, 24/31.
[236] “Miqnə” (cəmi: məqani) də ximarın sinonimidir. İbn Kəsir ayədə keçən ximarı açıqlayarkən, “Bu insanların miqnə dediyi şeydir” deyir.
[237] Buxari, Təfsiru-surə 24/12.

Digər müfəssir Qurtubi isə öz təfsirində “ximar” sözünün mənasını açıqlamaqla yanaşı, “cuyub” (yaxalar) sözünə də belə izah vermişdir: “Cuyub, köynək və əntarinin (paltarın) kəsildiyi yer mənasındadır”. Muqatil deyir ki, **“yaxalarının üstünə”** buyruğu, sinənin üzərinə deməkdir. Yəni yaxalarının olduğu yerin üzərinə baş örtüklərini salsınlar.[238]

İmam Maturidi “Tə’vilətu Əhlis-Sünnə” təfsir kitabında belə yazır: “Gizli zinət yerləri, sinə, qulaqlar və baldırlardır.”[239]

Digər örtünmə ilə bağlı ayədə Uca Allah belə buyurur: **“Ey Peyğəmbər! Zövcələrinə, qızlarına və möminlərin zövcələrinə** (evlərindən çıxdıqları zaman) **cilbablarını örtmələrini söylə! Bu, onların tanınmamaları və incidilməmələri üçün daha münasibdir. Allah bağışlayandır, rəhimlidir.”**[240]

Ayədəki “cilbab” sözünün lüğətdə geniş paltar, köynək və baş örtüyü mənaları var. Qadını başdan aşağı örtən çarşab, ferace, manto kimi geyimlər də, cilbab mənasına gəlir. “Cilbab”, bir fiqh termini olaraq, Elmalılı Hamdi (ö/1939) tərəfindən belə tərif edilmişdir: “Qadınların paltarlarının üstünə geydikləri hər növ geyimdir”, “Qadını təpədən dırnağa qədər örtən geyimdir”, “Qadınların örtündükləri hər cür paltar və başqa geyimlərdir”.[241]

Sünnətdə örtünmə barədə dəlillərə gəlincə isə, bu hədislər qadınlarımıza bir örnək olsun: “Aişədən (r.a) rəvayət olunan hədisə görə, Əsma bint Əbu Bəkr (r.a) Allah Rəsulunun ﷺ hüzuruna daxil oldu və üzərində incə bir paltar vardır. Peyğəmbər ﷺ üzünü çevirdi və buyurdu: **“Ey Əsma! Şübhəsiz qadın həddi-büluğ yaşına çatarkən onun bu və bu yerlərindən başqa yerlərin görünməsi uyğun değildir.”** Peyğəmbər ﷺ bunu deyərkən üzünə və ovuclarına işarə etmişdir.[242]

Digər bir hədisdə də, Peyğəmbər ﷺ belə buyurur: **“Allah-Təala həddi-büluğ yaşına çatan qadının namazını baş örtüsü olmadan qəbul etməz”**[243] İmam Əbu Hənifəyə (r) görə, bir üzüvün dörddə birə qədər olan hissəsi açılarsa, namaz səhihdir. Lakin açılan yer üzvün dörddə birindən çox olarsa, namaz pozulur.[244]

Buxarinin “əs-Səhih”ində Əhməd İbn Şəbibdən nəql olunan rəvayətdə Aişə (r.a) baş örtüyünü ilk dəfə necə tətbiq edildiyini belə açıqlamışdır: “Allah, ilk mühacir qadınlara rəhmət etsin. Allah-Təala: **“Baş örtüklərini yaxalarının üstünə salsınlar”** ayəsi nazil olduğunda, onlar üst geyimlərini bölüb bunlarla başlarını örtdülər”.[245]

---

[238] Qurtubi, 12/153.
[239] İmam Maturidi “Tə’vilətu Əhlis-Sünnə”, 3/453.
[240] Əhzab, 33/59.
[241] Elmalılı, 6/337.
[242] Əbu Davud, 4/358.
[243] İbn Macə, Təharət, 132; Əbu Davud, Salət, 84 və s.
[244] Şəukəni, “Nəylul-əutər”, 2/68.
[245] Buxari, Təfsiru-surə 24/12; İbn Kəsir, 2/600.

## *II - Qadının örtünməsində lazım olan keyfiyyətlər*

***1.Örtünmədə əl və üzdən başqa bütün bədənin örtülü olması:***

Qadınların əl, üz və ayaqları xaric, sallanan saçları da daxil olmaqla, bütün bədənləri namazda və naməhrəm kişilərin yanında örtülməli olan övrət yerləridir.

Əksər fəqihlərə görə, naməhrəm kişiyə görə qadının bütün bədəni övrətdir, ancaq üz və əllərindən başqa. Çünki qadının kişilərlə ticarət münasibətlərinə ehtiyacı var.[246] Lakin üz və əllərin açılması fitnədən əmin olmağa bağlıdır.

İmam Əbu Hənifəyə (r) görə, ayaqların görünməsi caizdir. Çünki Allah-Təala zinət yerlərinin görünməsini nəhy etmişdir, lakin öz-özündən görünən yerlər burda istisnadır. Ayaqlar da öz-özündən görünən yerlərdən biridir.[247]

İbn Abidin isə, qadının biləkləri üçün belə demişdir: **"Biləklərin görünməsi övrətdir, çünki biləklər örfən və istifadə baxımından öz-özündən görünən yerlərə şamil olunmur**".[248]

"ən-Nur" surəsinin: **" Öz-özlüyündən görünən qisimlər istisna olmaqla, zinətlərini göstərməsinlər"**[249] ayəsi dəlil olmaqla, üz və əlləri açmaq və onlara baxmaq caizdir.[250]

***2.Örtündüyü geyimin altını və bədən xətlərini göstərməmısi:***

Qadının geyimi övrət yerlərini aşkar etməyib onları gizlətməli və bədən quruluşunu göstərməməlidir. Belə geyimlər islami geyimlər sayılmır və müsəlman bir qadın bu cür paltarlardan çəkinməlidir.

Geyimin altından bədən dərisinin rəngi göründüyü halda, qadının övrəti açılmış sayılır. Naməhrəm bir kişinin qarşısına belə incə paltarla çıxa bilməz. Hətta namazda da, namazdan kənar zamanlarda da bu geyimlər qadına caiz deyil. Belə paltarda qılınan namaz səhih deyil. Ancaq zövcünün gördüyü halda, qadının geyimi caiz olur.[251]

Bu mövzu ilə bağlı müxtəlif hədislər gəlmişdir. Cərir bin Abdullahdan belə bir hədis rəvayət olunmuşdur: **"Həqiqətən kişi geyim geyər, lakin çılpaq olar"** yəni incə paltar onu çılpaq göstərər".[252]

Üsamə bin Zeydin (r.a) rəvayət etdiyinə görə, Allah Rəsulu ﷺ, Dihyə Əl-Kəlbinin (r.a) (Misirdən) gətirib onun özünə hədiyyə etdiyi "qubtiyyə"dən (ağ rəngdə incə Misir parçası) geyinməyim üçün mənə bir paltar verdi. Sonra mən

---

[246] "Təkmilətu Fəth-il-qadir məal-hidayəti", 8/97; "Təbyin-ul-haqaiq", 1/96,97.
[247] "Bədai-us-sanəi", 2/2956, "İmam" mətbəəsinin nəşri.
[248] "Haşiyətu İbn Abidin", 1/405, 2-ci nəşr.
[249] Nur 24/31.
[250] "Bədai-us-sanəi", 2/2956.
[251] Döndüren, 228.
**Şafiilərə** görə, övrəti örtən paltar incə olub və bədən üzvünün formasını göstərəcək qədər bəlli olarsa, bu məkruhdur. Şafii, "əl-Umm", 1/78.
[252] Təbərani , 2/329; "Məcməuz zəvaid", 5/136.

də onu xanımıma geydirdim. Buna görə Peyğəmbər ﷺ: **“Nə oldu niyə qubtiyyəni geymədin?” -** buyurdu. Mən: “Onu zövcəmə geydirdim” - dedim. Sonra Peyğəmbər ﷺ belə buyurdu: **“Zövcənə söylə, onun altına bir astar qoysun. Qorxuram ki, onu astarsız geysə, xanımının sümüklərinin həcmini göstərər”.”**[253]

Burada altından bədənini göstərən libasın geyinməsini qadağan edən dəlil vardır. Buna görə Əlqamənin (r.a) anasının belə dediyini nəql edən hədis gəlmişdir: “Hafsa bint Abdurrahmən (r.a) Aişənin (r.a) yanına daxil oldu. Hafsanın üzərində incə bir ximar vardır. Ayşə onu parçaladı və ona qalın bir ximar geydirdi.”[254]

***3.Qadının evdən çıxarkən ətirlənməsi:***

Ətirlənmə, Əbu Əyyubdan (r.a) rəvayət olunan: **“Peyğəmbərlərin dörd sünnəti var: xına, ətir, misvak və nigah”**[255] hədisə və Peyğəmbərin ﷺ: **“Dünyanızdan mənə üç şey sevdirildi: gözəl ətir, qadınlar və gözümün nuru olan namaz”**[256] hədisinə görə sünnətdir.

Qadınlara isə, evindən çıxarkən rəngi aşkar, qoxusu gizli olan ətirlə ətirlənmək sünnətdir. Belə ki, Tirmizinin və Nəsəinin Əbu Hureyrədən (r.a) rəvayət etdiyi hədisə görə: **“Kişilərin ətrinin qoxusu aşkar, rəngi gizli, qadınların ətrinin isə qoxusu gizli, rəngi aşkardır”**.[257]

Lakin qadına evdən çıxarkən qoxusu uzaqdan və ya yaxından hiss edilən ətir vurmaq qadağandır. Çünki, Allah Rəsulu ﷺ buyurur: **“Həqiqətən bir qadın ətir vurub onun qoxusunu hiss edən kişilərin yanından keçərsə, o qadın zinakar qadındır”**[258]**.** Amma evində istədiyi kimi, gizli və ya aşkar, heç bir maneə olmadan, ətirlənər.

Qadının bayram namazı üçün ətirlənməsinə gəlincə, onun bəzəklı paltar geyinmədən, ətir vurmadan evdən çıxıb məscidə getməsində bir eyib yoxdur. Çünki, Peyğəmbər ﷺ buyurur: **“Allahın qadın qullarını, Allahın məscidlərinə** (gedib ibadət etməyə) **mane olmayın! Lakin qadınlar,** (Allahın məscidlərinə gedərkən) **ətir vurmamış halda (çölə) çıxsınlar.”**[259]

Oruclu kəsin ətirlənməsi isə, hənəfilərə görə, mübahdır.[260]

Boşanmış qadınların ətirlənməsinə gəlincə isə, üç dəfə boşanmış qadına üzərindəki yasın vacibliyinə görə ətirlənmək haramdır. Çünki o zövcü vəfat edən qadın kimi, səhih nigahdan ayrılıb iddət gözləyir.[261]

---

[253] Əhməd, 5/205; Əl-Heysəmi, “Əl-Məcmu”, 5/137.
[254] Beyhəqi, 2/235.
[255] Tirmizi, 3/382; İmam Əhməd, 5/421; Əl-Bəğəvi, “Şərh-us sunnə”, 9/5.
[256] Əhməd, 3/128; “Fəyd-ul-qadir”, 3/370.
[257] Əhməd, 2/541; Əbu Davud, 2/625; Tirmizi, 4/107.
[258] Əhməd, 4/414; Tirmizi, 5/106.
[259] Əbu Davud, 1/381; Əhməd, 2/438; “Məcmu-uz-zəvaid”, 2/33.
[260] “Haşiyətu İbn Abidin”, 2/417.
[261] “Radd-ul muxtər alə durr-il muxtər”, 2/617.

Bir bain talaqla boşanan qadının da hökmü eynidir. O da yas tutmalı olduğuna görə ətirlənməyi tərk etməlidir. Əgər boşayan kişi qadına ətir vurmamağı buyurarsa, onun şəriətə görə buna haqqı var.[262]

***4.Qadının özünü kişiyə bənzətməməsi:***

Fiqh alimləri qadının özünü kişiyə bənzətməsinin haram olduğunu bildirmişlər.[263] Belə ki, Buxari İbn Abbasdan (r.a) belə rəvayət etmişdir: **"Allah Rəsulu ﷺ kişilərin özünü qadınlara, qadınların da özünü kişilərə bənzədənləri lənət etmişdir".**[264]

Eləcə də, geyimlərində, hərəkətlərində, davranışlarında və səslərində özünü kişiyə bənzətmək, məkruhdur.[265]

Geyim şəkli, hər ölkənin adət-ənənəsinə görə fərqlənir. Bəzən qadınların geyimləri kişilərinkindən fərqlənmir, lakin qadınlar hicab geyinib örtünmələri ilə seçilirlər.[266]

Danışıqda və yerişində bənzətməni qınamağa gəlincə isə, bu bilərək edən kəs üçündür. Lakin xilqətində və təbiətində olan kəsə bu aludəçiliyini tədricən tərk etmək əmr olunur. Ancaq razılıq göstərib tərgitməyə başlayan kəsdən başqa, bənzətməni davam edənlər isə, qınanılır.[267]

***5.Qadının naməhrəm yanında səsini incəltməsi:***

Qadına naməhrəm kişilərlə danışarkən təbii səsi ilə danışmağında bir eybi yoxdur. Nə sərt, nə də yumşaq danışar. Çünki, Allah-Təala buyurur: **"Ey Peyğəmbərin zövcələri! Siz başqa qadınlar kimi deyilsiniz. Əgər Allahdan qorxursunuzsa,** (yad kişilərlə) **ədalı danışmayın, yoxsa qəlbində xəstəlik olan bir kimsə** (sizə qarşı) **ümid bəsləyər. Düzgün danışın!"**[268]

Ibn Kəsir ayə barəsində demişdir:**"Bu ədəblər, Allah-Təalanın Peyğəmbərin ﷺ zövcələrinə və bu məsələdə onlara tabe olan ümmətin qadınlarına bir əmridir"**.[269]

Qurtubi isə, ayəni belə təfsir edir: **"Onlara tam, ciddi şəkildə və fasiləli olaraq danışmaq əmr olundu. Lakin qəlbdə bir bağlılıq yəni bir təmənna meydana gəlməsi baxımından yumşaq tərzdə danışmasınlar."**[270]

---

262 "Radd-ul muxtər alə durr-il muxtər", 2/617.
263 "Nil-ul-əutar", 2/117.
264 Buxari, "Fəth-ul bəri", 10/332.
265 "Fəyd-ul qadir", 5/269.
266 "Umdət-ul-qari", 22/41.
267 "Fəth-ul bəri", 10/332; "Fəyd-ul qadir", 5/271.
**Şafiiyə** görə, qadının özünü kişiyə bənzətməsi, məkruhdur. Eləcə də, libasında, hərəkəti, susması, davranışları və səslərində bənzətməsi, məkruhdur. "Kəşşəf-ul-qinəi".
268 Əhzab 33/32.
269 "Təfsiru Ibn Kəsir", 3/482.
270 "Təfsirul-Qurtubi", 14/177; "Əl-Mədxəlu li İbnil Hac", 1/32.

***6.Qadınların yerişlərini gözəlləşdirməməsi:***

Insanın adətən özünəməxsus bir yerişi olur. Lakin nəzəri cəlb edən süni yerişə gəlincə, belə yerimə qadağan edilmişdir. Bu həm kişiyə, həm də qadına aiddir. Çünki qadına edilən əmr örtünməyə əsaslanmışdır. Çünki, Allah-Təala buyurur: **“Gizlətdikləri zinətlər bilinsin deyə ayaqlarını yerə vurmasınlar”**.[271]

Qurtubi ayə barəsində belə demişdir: **“Kim zinətləriylə fərəhlənərək belə edərsə, məkruhdur. Lakin kim kişilər üçün bəzənmə və özlərini göstərmək üçün edərsə, bu məzəmmət edilən haram bir işdir.”**[272]

Buna ən gözəl örnək, Allah Rəsulunun ﷺ yerişidir. Rəvayət edilmişdir ki, Peyğəmbər ﷺ vüqarla yeriyərdi və insanların ən sürətli, ən gözəl və ən sakit yeriyəni idi.[273] Burda qəsd olunan Allah-Təalanın bu ayəsidir: **“ Rəhmanın** (xalis) **qulları o kəslərdir ki, yer üzündə təvazökarlıqla yeriyər,..”.**[274] Sələflərdən olmayan bir alim isə hədisi belə şərh etmişdir: **“Yəni təkəbbürlükdən və zəiflikdən uzaq sükunətli və vüqarlı yerişlə yeriyərdi”.**[275]

---

[271] Nur 24/31.
[272] “Təfsir-ul Qurtubi”, 12/238.
[273] Muslim, 4/1815.
[274] Furqan 25/ 63.
[275] “Zad-ul məad fi hudə xayrul ibad li İbnil Qayyim”, 1/167.

## *III - Müsəlman bir qadın kimlərin yanında və necə örtünməli?*

***1) Ərinin yanında:***

Ər-arvad bir-birilərinin bədənlərinin hər tərəfinə baxa bilərlər. Çünki aralarındakı islami nikah toxunmalarını və baxmalarını məşru edir. Lakin “qəliz övrət” sayılan həya yerlərinə baxmamaları, ədəbə daha uyğundur. Çünki Aişədən (r.a) gələn hədisdə: “Mən Peyğəmbərin ﷺ cinsiyyət üzvünə heç baxmadım” dediyi nəql olunmuşdur.[276]

***2) Məhrəmlərinin yanında:***

Qadın, ata, oğul, qardaş və ögey oğul və digərləri kimi aralarında əbədi olaraq evlənmə maneəsi olan yaxınlarının yanında təsəttürsüz gəzə bilər.

Məhrəmlərinə görə qadının övrəti, göbəyilə dizləri arasıdır, eləcə də kürəyi və qarnıdır[277]. Yəni məhrəmi olan kəslərin bu üzvlərdən başqa, qalan yerlərinə fitnədən əmin olduğu və nəzəri şəhvətdən uzaq olduğu zaman qadına baxmağı halaldır. Buna dəlil, Allah Azzə və Cəllənin: **“Zinətlərini ərləri, ataları.... başqasına göstərməsinlər”** [278] ayəsidir. Zinətdən məqsəd, özlüyündə zinət olmayan yerlərdir. Çünki zinətin əslinə, yəni üz və əllərə baxmaq, mütləq şəkildə mübahdır. Kürək, qarın və baldırdan fərqli olaraq, baş tac qoyulan, üz sürmə sürülən, boyun və sinə boyunbağı, qulaq sırğa, qol və bilək bilərzik, əl üzük, topuq xalxal taxılan, ayaq boya sürülən yerlərdir. Ona görə kürək, qarın və baldır, zinət yerləri deyil.[279]

Həmçinin, məhrəmlərin arasının qarışması, ictimai yəni ümumi qəbul edilən bir məsələdir. Buna görə zinət yerlərinin açılıb görünməkdən qorumaq mümkün deyil.

İmam Maturidi “Tə’vilətu Əhlis-Sünnə” kitabında yuxarıda sözü gedən ayəni belə təfsir etmişdir: “Qadının zinətinə baxmaq məsələsində ata, ayədə adı çəkilən məhrəmlər və ər bir aradadır. Ataya qızının övrət yerlərindən ancaq başına baxmağı caiz olması barədə xilaf yoxdur. Üzərində ximar olmayan başa və sirğa və bənzəri zinət əşyaları taxılan qulaqlara baxmaq caizdirsə, sinəyə də baxmaq onlara (məhrəmlərə) olar. Həmin yerlər ximarla örtüldüyünə görə zinət yerləridir. Dirsəklərə və xalxal taxılan yerlərə yəni ayaqlara da baxılır. Lakin bunlar naməhrəmin baxması caiz olmayan batini zinət yerləridir”.[280]

Örtük olmadan bütün caiz olan yerlərə baxmaq, fitnədən əmin olan zaman toxunmaq da caizdir. Əks halda, caiz olmaz. Həmçinin bir dam altında ailə

---

[276] Əhməd b. Hənbəl, 6/63,190.
[277] “Əl-Hidayətu məa təkmiləti fəth-il-qadir val-inayəti”, 8/103, 104; “Təbyin-ul-haqaiq”, 6/19.
[278] Nur 24/ 31.
[279] “Təbyin-ul-haqaiq”, 6/19.
[280] İmam Maturidi “Tə’vilətu Əhlis-Sünnə”, 3/453.

fərdlərinin təkbaşına xəlvətdə qalması da, caizdir.[281] Çünki, Peyğəmbər ﷺ Fatiməni (r.a) öpərdi.[282]

Yuxarıda qeyd etdiyimiz kimi, məhrəmi olan kişinin qadının kürəyinə və ya qarnına yaxud baldırına baxmağı caiz deyil. Eynilə, bu üzvlərdən birinə toxunmaq da caiz deyil. Çünki Allah Subhənə və Təala ziharı çirkin bir söz və zorakı bir iş etdi. Zihar, yəni zövcəsini anasının belinə bənzədib, özünə haram etməsidir. Əgər anasının belinə və qarnına baxmaq və ya onlara toxunmaq haram olmasaydı, zihar da çirkin söz və zorakı iş olmazdı.

Kişiyə məhrəmlərinin bütün halal olan yerlərinə baxmaq və toxunmaq, qadının da öz məhrəmlərinə olduğu kimi halaldır. Bütün haram olanlar da haramdır.[283]

Həmçinin, fiqh alimlərinə görə, qadına elçi getmək istəyən kəs qadına baxa bilər. Burda qadının özünün və ya vəlisinin baxmağa izni olub olmamasının fərqi yoxdur.[284] Çünki Peyğəmbər ﷺ Muğirə bin Şu’bəyə (r.a) buyurur: **“Qadına elçi gedən vaxt, ona bax. Çünki baxmaq aranızdakı uyğunluq üçün daha müvafiqdir”**.[285]

Həmçinin qadın da naməhrəm kişiyə ailə qurmaq məqsədilə baxar.[286]

3) ***Başqa qadınların yanında:***

Qadının qadınlara görə övrət yeri, göbəyi ilə dizləri arasıdır. Buna görə qadına bu iki üzvü arasındakı yerdən başqa, bütün bədəninə baxmağı caizdir. Bu onların eyni cinsli olduğuna və əksər halda şəhvətin olmadığına görədir. Lakin şəhvət meydana gəldiyində və fitnə qorxusu olduğu halda haram olur.[287]

Amma müsəlman qadına görə müşrik və kafir qadınlar, naməhrəm kişi dərəcəsində sayılır. Bu qadınların müsəlman qadının bədəninə baxması və qarşısında soyunması caiz deyil. Çünki, Allah-Təala buyurur: **“Zinətlərini ərləri, ataları, ərlərinin ataları, oğulları, ərlərinin oğulları, qardaşları, qardaşlarının oğulları, bacılarının oğulları, öz qadınları ... başqasına göstərməsinlər”.**[288] Burda “**öz qadınları”** dedikdə, müsəlman qadınları nəzərdə tutulur. Əgər müşrik və kafir qadının baxması caiz olsaydı, ayədə xüsusiləşdirməyin bir faydası olmazdı. Ona görə Ömər (r.a) əhli-kitab qadınların müsəlman qadınlarla birlikdə hamama girmələrini qadağan etmişdir.[289]

---

[281] “Əd-Dər-ul-muxtər məa haşiyəti İbni Abidin”, 6/367.
[282] Tirmizi , 5/700.
[283] “Bədai-us-sanəi”, 6/2952, 2954.
[284] “Əl-Hidəyətu məa təkmiləti fəth-il qadir val-inayəti”, 8/99.
[285] Tirmizi, 3/388.
[286] **Şafiiyə** görə, qadın da naməhrəm kişiyə ailə qurmaq məqsədilə baxar. “Muğn-il-muhtəc”, 3/128.
[287] “Bədai-us-sanəi”, 6/2961; “Təbyin-ul-haqaiq”, 6/18.
[288] Nur 24/31.
[289] Qurtubi, 12/155.

*4) Naməhrəm kişilərin yanında:*

Qadının naməhrəm kişilərə qarşı üzü, biləklərə qədər əllər və ayaqlar istisna olmaqla, bütün bədəni övrətdir.

Bu məsələni İmam Maturidi özünün təfsir kitabında belə açıqlayır: "Naməhrəm bir kəs üçün üzə baxmaq, qadağan olunan başa və digər zinət yerlərinə baxmaqdan daha doğru olanıdır. Çünki üzdə bütün gözəlliklər cəm olmuşdur, lakin digər zinət yerlərində bu gözəlliklər olmur. Amma yalnız bu yerlərə baxmaq haram edilmişdir, çünki onlar özlüyündə övrətdirlər. Naməhrəm şəxsə də övrət yerlərinə baxmaq haramdır. Çünki onlara baxmaq, yəni zinət yerlərini nəzərdə tuturam, yalnız şəhvət üçündür və şəhvətli baxış haramdır."[290]

*5) Zərurət və müalicə üçün örtünmə:*

Fiqh alimlərinin ittifaqıyla həkimin övrət yerinə baxmağı, mualicə üçün ona toxunmağı və xəstə olan yerə zərurət miqdarı baxmağı caiz sayılır. Zərurətlərin ölçüsünə gəlincə, ancaq ehtiyac olan yer açılır və yalnız xəstə yerə bacardığı qədər gözləri yarı qapalı vəziyyətdə baxılır. Əvvəldən qadınları mualicə etməyi qadına öyrədilməlidir, çünki qadının qadına baxmağı daha yüngüldür.

Məcburi və ehtiyac hallarında isə, kişi və ya qadının öz cinsindən olan birinə və ya digər cinsə övrətini açması caiz görülmüşdür. Eləcə də, qabilə qadına (mamaçaya) doğum vaxtı və ya bəkarətinin təyinində yaxud bənzəri hallarda qadının övrət yerinə baxmaq da caizdir.

Qadın həkim tapılmadıqda, kişi həkimin xəstə naməhrəm qadını müalicə etməyi, habelə, məcburi hallarda qadına baxmaq və ya toxunmağı caiz saymışlar. Müsəlmanlardan qadın və ya kişi həkim tapılmadıqda isə, zimmi (xristiyan və ya yəhudi) həkimin baxması caizdir.[291]

Kişi həkim tapılmadığı halda da, qadın həkimə məcburi hallarda xəstə kişiyə baxmaq, toxunmaq və müalicə etmək caizdir.[292]

Fəqihlər sözü gedən məsələdə bu hədisi dəlil götürmüşlər: "Osman bin Affana (r.a) oğurluq edən bir kölə gətirdilər və o da onun izarına (beldən aşağı geyinilən libas) baxmağı buyurdu. Lakin kölədə hələ bədən tükü bitmədiyini

---

[290] İmam Maturidi "Tə'vilətu Əhlis-Sünnə", 3/454.

[291] **Şafiiyə** görə, həkim xəstə qadına naməhrəm olduqda, qadağan hal düşşün deyə onun yanında inandığı bir qadın olmasının labüddür. "Kəşşəf-ul-qinəi", 5/13. Həmçinin**,** xəstə qadın olduğu halda, mualicə edən həkim kafir qadın olsa belə, mualicə almasında və ya tibbi yardım göstərilməsində, yanında bir qadın və kişi xəstənin yanında isə bir kişi olması şərtdir. Eləcə də, ancaq əmin olan kəsin yanında güvənilən birinin olması, zimmi kişinin yanında müsəlman bir kişinin olması yaxud zimmi qadının yanında müsəlman bir qadının olması da şərtdir. "Həvaşi əş-Şirvani və İbnul-Qasim alə Tuhfət-il-Muhtəc", 7/202, 203.

[292] **Şafiiyə** görə, əgər qadını müalicə edən müsəlman həkim tapılsa, lakin o müalicə haqqından narazı qalıb adəti olandan daha çox tələb edirsə, onda belə bir müsəlman həkimin olmadığına hökm verilir və müalicə haqqına razı olan kafir həkimdə müalicə almasına icazə verilir. "Əl-Fəvakih-ud-Dəvani", 2/366, 367.

yəni yetkinlik yaşına çatmadığını gördülər. Ona görə həmin kölənin əlini kəsmədilər”.[293]

***6) Naməhrəm kəsə toxunmaq və salamlaşmaq:***

Bir qadın öz həmcinsləriylə əl verib salamlaşdığı kimi, məhrəmləriylə də salamlaşa bilər. Lakin fitnə qorxusu olduğu halda, qadın məhrəmləriylə məsafə saxlamalıdır. Ögey oğul və süd yoluyla olan qohumları ilə cavan ögey ana da, buraya daxildir.

Fəqihlər cavan naməhrəm qadına toxunma məsələsində bu görüşdə olmuşlar: **“Yaşlı və qoca qadınla salamlaşmağın, əlinə toxunmağın fitnə qorxusu olmadığı üçün eybi yoxdur.”**[294] Çünki Əbu Bəkr (r.a) yaşlı və qoca qadınlarla salamlaşdığı və Abdullah bin Zübeyr (r.a) xəstələndiyi vaxt ona qulluq etmək üçün yaşlı bir qadını xidmətçi tutduğu nəql olunmuşdur.[295]

[293] “Bədai-us-sanəi”, 6/2959.
[294] “Bədai-us-sanəi”, 6/2961, 2962; “Təbyin-ul-haqaiq”, 3/133,134; “Təkmilətu fəth-il-qadir”, 7/101.
[295] Məusili, “əl-İxtiyar”, 4/155.

## *IV - Geyimlərdə haram və ya məkruh olanlar*

### *Üzərində naxışlar, təsvirlər, xaç və ayələr olan geyimlər*

Kişiyə və qadına səhih görüşə görə, üzərində heyvan təsvirləri olan paltarlar geyinmək haramdır. Çünki, Əbu Talha rəvayət etdiyi hədisdə Allah Rəsulunun ﷺ belə buyurduğunu eşitdi: **"İçərisində it və heyvan təsvirləri olan evə mələklər daxil olmaz."**[296]

Əgər şəkildən baş kimi bir üzvü silməklə rəsm heç nəyi canlandırmırsa və ya başı olmayan bir şəkildirsə, onun bir eybi yoxdur.

Paltarda xaç şəkli haram olduğu kimi, araxçın (takkə) və digər geyimlərdə belə şəklin olması haramdır. Belə ki, Aişə (r.a) demişdir: **"Peyğəmbər ﷺ evində, üzərində xaç şəkli olan hər şeyi pozardı."**[297] Yəni başqa yeri deyil, xaç olan yeri kəsərdi. Bu, geyimlərə, örtüklərə, xalçalara, alətlərə və digər əşyalara şamil edilir. Eləcə də, səhih görüşə görə, toxunmuş paltarda da belə təsvirlər haramdır. Belə ki, Peyğəmbər ﷺ buyurur: **"Qiyamət günü əzabı ən şiddətli olanlar, rəssamlardır."**[298]

Üzərində heyvan təsvirləri və ya xaç olan geyimdə namaz qılmaq, namaz səhih olsa da, haramdır. Belə ki, Ənəs (r.a) demişdir: "Aişənin evinin bir tərəfini örtən naxışlı bir örtüyü vardır. Peyğəmbər ﷺ ona: **"Bunu qarşımdan götür, çünki onun üzərindəki şəkillər, namazda ikən mənə görünüb durur"-** buyurur."[299] Eləcə də, üzərində ayələr yazılan paltarı geyinmək, namaz qılanı namazdan yayındırır yaxud belə geyindiyinə görə namaza hörmətsizlik olur.

Ağac, ay, dağlar və bütün ruhu olmayan cansız varlıqların şəkilləri çəkilmiş paltarın geyinməsində bir eyib yoxdur. Buxari İbn Abbasdan (r.a) rəvayət etdiyinə görə, o bir rəssama belə demişdir: **"Əgər deyilənləri dinləməsən, vay olsun sənə! Rəsm çəkmək istəyirsən? Onda ağacları və ruhu olmayan cansız varlıqların şəklini çək."**[300] Bu əksər fiqh alimlərinin müraciət etdiyi hədisdir.[301]

---

[296] Buxari, "Əl-Fəth", 10/276.
[297] Buxari, "Əl-Fəth", 10/385.
[298] Buxari, "Əl-Fəth", 10/382.
[299] Buxari, "Əl-Fəth", 10/391.
[300] Buxari, "Əl-Fəth", 4/416.
[301] "Haşiyətu İbn Abidin", 1/607; "Əl-Fətəval-xaniyyə bi həmiş-il-fətəval-hindiyyə", 6, s.369; "Nil-ul-əutar liş-Şəukəni", 2/97-101.

# Altıncı fəsil

# Müxtəlif şəriət əhkamları

- **Hamiləliyin qarşısını alma üsulları**
- **Abortla bağlı əhkamlar**
- **Süni mayalanma**
- **Qadınlar üçün təharət və ibadətlərdə gətirilən bəzi rahatlıqlar**
- **Qadınların səfər əhkamları**
- **Yas tutan qadınların əhkamları**
- **Gözəllik üçün cərrahi və bənzəri əməliyyatlar**
- **Bədən gigiyenası**
- **Saçlarla bağlı əhkamlar**
- **Müasir fətvalar**

## *I - Hamiləliyin qarşısını alma üsulları*

Qurani-Kərimdəki ayələr və Peyğəmbərdən ﷺ gələn hədislər bizə evlənmədə olan məqsədi açıqlayır:

**“Sizin üçün onlarla ünsiyyət edəsiniz deyə, öz cinsinizdən zövcələr xəlq etməsi, aranızda (dostluq) sevgi və mərhəmət yaratması da Onun qüdrət əlamətlərindəndir”**[302]

Allah Rəsulu ﷺ isə belə buyurur: **“Evlənin və çoxalın, çünki mən Qiyamət günü ümmətimin çoxluğu ilə öyünəcəm”**.[303] Hədisdən bizə aydın olur ki, evlənməyin bir məqsədi də, nəslin çoxalmasıdır.

Lakin bəzən insanlar fəqirlik qorxusundan Allahın yaratdığı canlı varlığı doğmadan öldürürlər. Bu məqsədlə Adəm övladının həyatına son qoymaq, İslam dinində caiz görülmür. Bunu Uca Allahın kəlamı təsdiqləyir: **“Övladlarınızı fəqirlik qorxusuyla öldürməyin. Onları da, sizi də biz ruziləndiririk. Həqiqətən onları öldürmək böyük gunahdır.”**[304]

Evliliyin tək məqsədi, uşaq dunyaya gətirib böyütmək olmadığı üçün hamiləliyin qarşısını almaq üsulları da İslamın ilk dövrlərindən bəri mövcud olmuşdur. Bunu Peyğəmbərdən ﷺ gələn bəzi hədislərdə rast gəlirik. Belə ki, Allah Rəsulu ﷺ “azil” edilməsinə izn vermişdir.[305] “Azil”, cinsi əlaqə zamanı kişi mənisinin xaricə axıdılmasıdır.

Hənəfi məzhəbinə görə də, azil, qadının izni olmaq şərtilə, caiz görülmüşdür. Dəlili bu hədisdir: “Peyğəmbər ﷺ bizi azad qadından izn almadan azil etməyə qadağan etdi”.[306] Qadın azlə razı olmadığı halda isə, onu etmək, məkruhdur.

Azil, hamiləlikdən qorunma yollarından biridir. Son dövrlərdə qorunma yollarının müasir tibbi metodları çıxmışdır. Bu da, qadının yumurtalıqlarının götürülməsi və kişinin sonsuzlaşdırma əməliyyatlarıdır. Hətta bəzən qeysəriyyə əməliyyatı zamanı uşağı çıxardıqdan sonra qadına xüsusi borular bağlayaraq sonsuzlaşdırma edilir.[307]

Dinimizə görə istər qadını, istərsə də kişini sonsuzlaşdırmaq haram sayılır. Bu barədə İslam alimi İbn Abidin belə söyləmişdir: “Qəssab heyvanlarını kökəlmələri üçün qısırlaşdırmaq caizdir. Digər heyvanları və insanları qısırlaşdırmaq haramdır.[308]

Qadını müvəqqəti olaraq sonsuzlaşdırmaq da, caiz deyil, haramdır.

---

302 Rum, 30/21
303 Nəsəi, Nikah, 11; İbn Macə, Nikah, 8; Müsnəd, 3/158.
304 İsra, 17/31.
305 Buxari, “Nikaḥ”, 96; Müslim, “Nikaḥ”, 125-138.
306 İbn Macə, “Nikaḥ”, 30.
307 İnsan ve Cinsi Hayat, s. 100.
308 İbn Abidin, 5/249.

Bundan başqa, azillə bağlı hökm, hamiləliyin qarşısını almaq üçün istifadə olunan həblər, prezervativ və spiral üçün də keçərlidir.

Spiral, müxtəlif şəkillərdə ola bilən və uterus (ana rəhmi) içərisinə yerləşdirərək hamiləliyin qarşısını alan bir vasitədir. Spiralla hamiləlikdən qorunma 97-98%-dir. Çox az sayda qadın spiral taxılmasına baxmayaraq, hamilə qala bilər. Spiral, bir qorunma mexanizmi olmaqla yanaşı, onun zərərləri də qadınlarda müşahidə olunur. O, sancılar, bel ağrısı, aybaşı qanaxmasının çoxalması, aybaşı müddətinin uzanması və ana rəhminin daxili iltihabı kimi səbəblərə yol aça bilər.

Spiral, islam alimləri tərəfindən caiz görülmüşdür. İbn Abidin, "ana rəhminin ağzını bağlamaq qadının haqqıdır. Lakin bunu ərinin izni olmadan etməsi haramdır" – demişdir.[309]

Spiral cinsiyyət üzvünün daxilinə yerləşdirildiyi üçün qüsla zərər verməz. Çünki daxili hissənin qüslda yuyulması lazım deyil. Spiral oruca zərər verməsə də, qadın onu yerləşdirən zaman oruclu olmamalıdır.[310]

---

[309] Asim Uysal-Mürşide Uysal, "Kadın ilmihalı", 603.
[310] Hamdi Döndüren, "Aile ilmihalı", s. 596, 597.

## *II - Abortla bağlı əhkamlar*

Hədislərdən məlum olduğu kimi, ana bətnindəki dölə 120-ci günündə ruh verilir. Bu 4 ay zaman ərzində Uca Allahın insan yaratma möcüzəsinin haldan-hala necə dəyişdiyini bir türk yazıçısı öz kitabında belə açıqlamışdır: “Dördüncü həftənin axırında döl, 5 mm-lik bir ölçüyə çatır. Göz və qulaqlar meydana gəlir. Baş və boyun hissəsi vücud uzunluğunun yarısını təşkil edir. Ürəyin başlanğıc halı əmələ gəlir. Həzm kanalına aid yemək borusunun, mədə və bağırsaqların isə, ilkin halları meydana gəlməyə başlayır. Bədən üzvlərinin də, ilk formaları ortaya çıxmağa başlayır. Beşinci həftədə dölün boyu 1 sm-ə çatır. Başı aşağı əyilərək ürəyin üzərini örtmüşdür. Qol və ayaqlar hələ inkişaf etməmişdir.”[311]

Deməк aydın olur ki, döllənmədən sonra 4-cü həftədən başlayaraq insan vücudu formalaşmağa başlayır. Buna İbn Məsuddan (r.a) rəvayət edilən hədisdən də anlamaq olur: **“Sizdən biriniz ana bətnində qırx günə nütfə şəklində toplanır, sonra qan laxtası olur, daha sonra ət parçası, ardınca da mələk göndərilib ona ruh üfürülür”**[312]

Həmçinin, yuxarıda qeyd etdiyimiz kimi, dölə yüz iyirmi gündən sonra ruh üfürülür. Fiqhdə abortla bağlı əhkamlar da, bu baxımdan iki yerə bölünür:

1. Ruh veriləndən sonrakı əhkamlar;
2. Ruh verilmədən əvvəlki əhkamlar.

### *Ruh veriləndən sonra edilən abortun hökmü*

Fiqh alimləri arasında ruh verildikdən sonra abortun haramlığı məsələsində ixtilaf yoxdur. Yəni alimlərin icması ilə, abort haramdır və onlar abortla insan övladını öldürdüyünü ifadə etmişlər.[313]

Ruh üfürüldükdən sonra dölün bətndə qalması ananın həyatına zərər edib və ya etmədiyi hallarına gəlincə isə, İbn Abidin bu məsələyə belə bir aydınlıq gətirmişdir: **“Döl diri olub onun qalmasıyla ananın həyatı təhlükədədirsə, dölü kəsib götürmək caiz deyil. Çünki ananın ölümü ehtimal olunur, ehtimallı iş üçün insanın qətli caiz deyil.”**

### *Ruh üfürülmədən əvvəl abortun hökmü*

Ruh üfürülmədən əvvəl edilən abortun hökmü barədə müxtəlif rəylər, hətta məzhəb içində çoxsaylı fikirlər mövcuddur. Bəzi Hənəfi fəqihlərin görüşünə

[311] Alparslan Özyazıcı, “Hücreden insana”, s.28-31.
[312] Buxari və Müslim, “Lu’lu’l va-l-mərcən”, s.1906.
[313] “Əl-Bəhr-ur-raiq”, 8/233; “Haşiyətu İbn Abidin”, 1/602, 5/378; “Fəth-ul-Qadir”, 2/495.

görə, belə abort caizdir. Çünki, bu, bətndə heç bir şey formalaşmayan hamiləlikdir. "Formalaşmayan" sözündən məqsəd, ruhun üfürülməsidir.[314]

Bəzi fəqihlər isə, ancaq üzrlü səbəbə görə caiz olduğunu söyləmişlər. Bu, məzhəbin səhih olan görüşüdür.

İbn Abidin Hənəfi fəqihi olan Əli bin Musanın görüşünü belə nəql etmişdir: **"Dölə ruh üfürülmə vaxtından əvvəl abort məkruhdur. Çünki ana rəhmində baş verən proseslərdən sonra dölün ətrafındakı, həyat mənbəyi olan su, ona diri olma hökmünü verir. Bu, eynilə həcc vaxtı ovlanan yumurtanı korlamağın haram olması kimidir**".[315]

Əgər qadın üzürsüz olaraq dölü düşürərsə, günah işləmiş olur. Məsələn, bir kəs həccdə olarkən ovlanan quşun yumurtasını sındırarsa, ona günah olub üzərinə cərimə gələr. Çünki yumurta quşun yaranmasının ilkin mərhələsidir. Dölün düşməsində də, korlanan yumurta qədər günah işlənmişdir. Ona görə üzürsüz olaraq döl düşürülərsə, bu günah bir əməl olacaq.

Ancaq şəri bir üzr mövcuddursa, qan laxtası halındakı dölü dərmanla düşürməkdə və ya abort etməkdə bir problem yoxdur.

İbn Abidin dölü düşürməkdə üzr sayılan halları belə müəyyən etmişdir:

a) Hamiləliyə görə qadının xəstəliyinin artması və ya ölüm təhlükəsinin mövcud olması;
b) Mühitin çox pozğun olmasına görə doğacaq uşağın islami əxlaq və tərbiyə ilə böyütmə çətinliyinin olması;
c) Yoxsulluq və zərurətin hökm sürməsi. Hamilə qadının süd əmən bir uşağının olması və hamiləliyə görə süd kəsilərsə, atanın uşağa süd anası tutma imkanının olmaması da bir üzr sayılmışdır.[316]

### *Abortun səbəbləri*

Abortun səbəbləri çoxdur. Həm nikahdan, həm də zinadan sonrakı hamiləlikdən məqsəd, hamiləlikdən azad olmaqdır. Eləcə də, abortun səbəbləri, hamiləliyin ananın sağlamlığına verən təhlükəni dəf etmək də ola bilər və ya yuxarıda qeyd edildiyi kimi, süd əmizdirə bilməmək qorxusu da ola bilər.

Həmçinin, abortun mənəvi və əməli səbəbləri olur.

1) ***Mənəvi səbəblər.*** Bunlar, özünü qorxutmaq, pis düşünən kəsin təsiri altında olub qorxmaq, ölümlə təhdid, alışmış olmadığı üçün bir polis

[314] "Fəth-ul-Qadir", 2/495; "Haşiyətu İbn Abidin", 2/380.
[315] "Haşiyətu İbn Abidin", 2/380.
[316] İbn Abidin, 2/380.

tərəfindən polis bölməsinə dəvət edilmək və hökmdarın hüzuruna çıxarılmaq kimi hallardır.

Buna İslam tarixindən bir misal gətirək:

Ömərin (r.a) xəlifəliyi dövründə bir qadının ifadəsini şəxsən özünün almasına ehtiyac vardır. Bu səbəblə qadını xilafət məqamına dəvət etmişdir. Ömərin (r.a) nə qədər ədalətli və ciddi olduğunu din və qanun adına güzəştə getmədiyini bilən o qadın, özündən asılı olmayaraq qorxub titrəməyə başlayır. Xilafət məqamına çatmadan, qadının yolda uşağı düşür. Uşaq bir-iki dəfə qışıqırıb ölür.

Vəziyyəti öyrənən Ömər (r.a) son dərəcə üzülür və şuranı toplayıb bu məsələdə nə edilməli olduğunu müzakirə edir. Şura üzvlərinin çoxu, bunda müəyyən qəsd olmadığı üçün bir şey lazım olmayacağını irəli sürərkən, Əli (r.a) susub bir şey söyləmir. Ömər (r.a) ona: "Ey Əbu Həsən! Sənin fikrin nədir? – deyə soruşur. O da: "Bu barədə dostlarımız öz fikirlərini söylədilərsə, hər halda xəta etdilər. Yox, səni qorumaq üçün belə dedilərsə, yaxşı nəsihətçi sayılmırlar. Ana rəhmindən qopub düşən və ölən uşağa diyət ödəmək lazımdır. Çünki onun ölümünə sən səbəb olmusan."

Təbii ki, Ömər (r.a) də bu ictihadı təsdiq edərək lazım olan diyəti ödəmişdir.[317]

Mənəvi səbəblərdən bəziləri də, özünü ac qoymaq, kəskin bir qoxu iyləmək, acı xəbərin, təhqirin və ya zülmün nəticəsində qəzəb və ya dərin kədərə düşməkdir.

2) ***Əməli səbəblər.*** Bunlar, döyülmə, yaralanma, ana rəhminə hər hansı bir alətlə dürtmə, uşağın düşməsi üçün dərman və ya ona bənzər bir maddə içməkdir. Eləcə də, ana rəhminə yad maddələr yerləşdirmək və ya ağır bir yük qaldırmaq yaxud da hamiləliyi qoruyub saxlamaq üçün ona yazılmış dərmandan imtina etməkdir.

Bu səbəblərdən biriylə qadının uşağı düşərsə, o cinayət işləmiş sayılır və diyət cəriməsi ödəməlidir.

### *Abortun kəffarəti və diyəti (cəriməsi)*

**Hənəfilər**, düşmüş uşaq barədə kəffarətin vacib olmadığını söyləmişlər. Buna dəlil, Peyğəmbərdən ﷺ rəvayət olunan hədisdir: **"Allah Rəsulu ﷺ qadının ölü olaraq düşən uşağı haqqında ğürrəylə hökm etmişdir"**[318]. Hədisdə anlaşıldığı kimi, ğürrəylə qəzavət edilmişdir, kəffarət isə zikr edilməmişdir.[319]

---

[317] "ət-Təşri-ul cinayil-isləm", 2/293.

[318] Buxari, "Fəth-ul bəri",12/247; Müslim, 3/1309.

[319] **Şafiiyə** görə, bir günahı olmadan qadından ölü uşaq düşərsə, kəffarət vacibdir. "Muğn-il-muhtəc", 4/108.

Fəqihlər belə demişlər: **“Düşmüş uşağın kəffarəti cəza mənasındadır, cəza isə pis işdən çəkindirmək üçün təyin olunur. Həmçinin kəffarət, Allah-Təalaya qulluq mənası daşıyır və bu oruc şəklində yerinə yetirilir. Məlumdur ki, bu cəza, insan qətlinə görə vacibdir. Ana bətnindəki döl, natamam olsa da, hansısa dərəcədə insandır. Ona görə dölü öldürməyi hökmsüz qoymurlar”.**

**Habelə, qətl hökmündə qiyas qaydası tətbiq olunmur. Eləcə də, qətl, bətndə yaradılmayan həyata görə gerçəkləşmir. Belə ki, dölün nə diri, nə də salamatlığı bilinir. Kəffarət isə qətl həyata keçməklə vacib olur”**.[320]

İmam Əbu Hənifəyə (r) görə, uşaq ölü düşərsə, ancaq diyət, diri düşdüyü halda isə, kəffarət lazımdır.[321]

Kəffarət, məlum olduğu kimi, bir kölə azad etmək və ya altmış fəqiri yeməklə təmin etmək ya da geyindirməkdir. Yaxud da altmış gün oruc tutmaqdır.

Abortun cəriməsinə (diyətinə) gəlincə, fiqh alimləri ğürrə ödənilməsinin vacibliyində ittifaq etmişlər. Çünki, bu məsələ Əbu Hureyrədən (r.a) və başqalarından rəvayət olunan hədislə sabitdir: **“Hüzeyl qəbiləsindən iki qadın dava etdilər. Bunlardan biri digərinə bir daş atdı və bətnindəki körpəni öldürdü. Allah Rəsulunun ﷺ qarşısında məhkəmələri oldu. Peyğəmbər ﷺ qadının ölən körpəsinin diyətini ğürrə ilə hökm etmişdir.”**[322]

Ğürrənin miqdarı, tam diyətin iyirmidə biridir (5%). Bu da, beş dəvə və ya əlli dinar[323] edir. Ğürrə hansı hallarda vacibdir:

1. Uşağın anadan ölü olaraq düşməsi;
2. Bir əməlin və ya sözün nəticəsində düşməsi;
3. Hamilə qadının uşağını özü və ya başqasının düşürməsi;
4. Uşağın bilərək və ya xəta üzündən düşməsi.

Ğürrənin miqdarı cinsə görə dəyişmir, qız və oğlanda eynidir.[324]

Alınan diyətə uşağı düşürən ana və ya başqa kəs varis ola bilməz. Düşən uşağın varisləri arasında bölünür. Qadın əkiz və ya daha çox uşaq düşürərsə, hər biri üçün ayrı diyət lazımdır.

---

[320] “Təbyin-ul-haqaiq liz-Zəyləi”, 6/128, 141, 143; “Bədai-us-sanəi”, 7/326.
[321] “ət-Təşri-ul cinayil-isləm”, 2/300, 302.
[322] “Nil-ul əutar liş-Şəukəni”, 7/70.
[323] 1 dinar, 4,25 qram qızıl edir.
[324] “Haşiyətu İbn Abidin”, 5/377.

## *III - Sün'i mayalanma*

Ana və atanın uşaq sahibi olmaq istəkləri ən təbii haqları olduğu kimi, bu istək dinimizə görə də təşviq edilmişdir. Çünki ailə qurma məqsədlərindən biri də uşaq sahibi olmaq, onların gələcəklərini hazırlamaq və bununla valideynlərin mədəni və sosial dəyərlərinin davamını təmin etməkdir. Lakin İslam dini, qanuni evlilik xaricində uşaq sahibi olma yollarını qadağan etmiş və bunu ictimai pozğunluğun səbəbi olaraq görmüşdür. İslamın evlənməyə təşviq edib zinanı qadağan etməsi, nəsil və ailəni zəiflədən hər cür təhlükəyə şiddətlə qarşı çıxması, nəticədə yenə insanın möhtərəmliyini və ailə quruluşunun sağlamlığını hədəf alaraq bu istiqamətdə ağla və sağlam fitrətə kömək etməkdir.

İslama görə bütün başqa nemətler kimi uşaq da, Allahın bəxşidir. Bununla bağlı Haqq-Təala belə buyurur: **"Göylərin və Yerin mülkü Allahındır. O, istədiyini yaradır. Kimə dilərsə ancaq qız, kimə dilərsə ancaq oğlan lütf edir. Yaxud hər ikisindən – həm oğlan, həm də qız verir. Kimi də dilərsə sonsuz edir. Şübhəsiz O, haqqıyla Biləndir, hər şeyə Qadirdir.[325]"** .

Allah-Təala yaratdığı hər şeyi bir səbəbə bağlamışdır. Bu səbəbləri araşdırıb kəşf edən təbiət qanunu, qədər inancımızla toqquşur. Buna görə sonsuzluq səbəbi ilə uşaq sahibi ola bilməyən cütlüklərin müalicə olunmaqlarında və nəticədə övlad sahibi olmalarında bir qadağan yoxdur və bu ən təbii haqlarıdır.

Müxtəlif xəstəliklərə görə övlad sahibi ola bilməyən cütlüklərin övlad sahibi olmaq üçün istifadə etdikləri üsullardan biri də **"sün'i mayalanma"** üsuludur. Yəni kişinin mənisi (sperma) alınıb, münasib bir xarici şəraitdə qadının yumurta hüceyrəsiylə mayalandırıb, sonra da qadının rəhminə yerləşdirilərək hamiləliyə və doğuma imkan yaratmaqdır.

Övlad sahibi ola bilməyən cütlüklərin tibbi müalicəsi və məqsədləri üçün imkan yaradılması kimi müsbət və xoş niyyətli bir başlanğıcı olan süni mayalanma üsulu, daha sonra Qərbdə inkişaf edərək fərqli ölçülər qazanıb cəmiyyətin ənənəvi, dini, əxlaqi və sosial dəyərlərinə zidd olan müxtəlif məqsədlərə alət olmağa başlamışdır. Bu məsələ öncə Qərbdə, sonra da Müsəlman cəmiyyətlərində müzakirə edilməyə başlamışdır.

İndiki dövrdə mövzu haqqında fikir bildirən İslam alimlərinə görə, müxtəlif səbəblərlə övlad sahibi ola bilməyən evli cütlüklərin istədiklərinə qovuşması istər tibbi müalicə, istərsə insan haqları baxımından müsbət və tərifəlayiq bir inkişafdır. Sün'i mayalanma yəni mikroinyeksiya üsulu da bu məqsədlə istifadə edilə bilər. **Ancaq bunda kişinin (ərin) mənisinin və zövcəsinin yumurta hüceyrəsinin istifadəsi və hamiləliyin də yenə xanımda olması şərtdir.** Mayalanmanın bu şərtlərlə rəhim xaricində həyata keçirilib sonradan analığa namizəd xanımın rahminə qoyulması dinimizə görə bir maneəsi olmaz. Lakin bu üsulun, ərin və ya xanımın təbii yoldan hamilə qalma imkanının olmadığı təqdirdə, tətbiq edilən istisna bir çıxış yolu və müalicə şəkli olduğunu unutmamaq lazımdır.

---

[325] Şura 42/ 49,50.

## *IV - Qadınlar üçün təharət və ibadətlərdə gətirilən bəzi rahatlıqlar*

### *Qüsl vaxtı övrətin açılması*

Fiqh alimləri, təkbaşına olduqda, qüsl vaxtı övrətin açılmasını caiz görmüşlər. Buna Əbu Hureyrədən (r.a) rəvayət olunan hədisi dəlil gətirmişlər: "Peyğəmbər ﷺ buyurur: **"Bəni İsraillilər bir-birilərinə baxaraq lüt çimərdilər, lakin Musa (a.s) təkbaşına çimərdi..."**[326]

### *Dəstəmazda ximar (hicab) üzərinə məsh*

Bildiyimiz kimi, dəstəmazda başa məsh çəkmək, fərzdir.

Qadının dəstəmazda başa məsh çəkmədən, ximarına məsh etməsi, ancaq incə ximardan suyun saçlara nüfuz edib çatdığı halda, caiz olur. Çünki Aişədən (r.a) belə bir hədis rəvayət olunur: **"O (r.a) əlini ximarının altına saldı və başına məsh edib dedi: "Bunu mənə Peyğəmbər ﷺ əmr etdi".**[327] Çünki ximarı çıxarmağın bir çətinliyi yoxdur və rüxsət isə, çətinliyi dəf etmək üçündür. Belə ki, Allah-Təala Kitabında buyurur: **"Başlarınıza məsh edin"**[328] yəni başdan başqa bir yerə məsh etmək caiz olmur.

### *Hörüklərin açılması*

Fiqh alimləri suyun saç diblərinə çatdığı halda, qüslda hörüklərin açılmasının vacib olmadığını söyləmişlər. Çünki rəvayət olunan bir hədisdə Ümmü Sələmə (r.a) Peyğəmbərə ﷺ belə demişdir: "Ey Allahın Rəsulu, saçlarımı hörük hörürəm, cənabət quslu üçün onu açımmı? O ﷺ belə buyurdu: **"Xeyir, sənə başın üzərinə üç ovuc su tökmək kifayət edər, sonra üzərinə su töküb təmizlənərsən"**.[329] Lakin su hörüklərin dibinə çatmadıqda, qadına onları tamamən açmağı vacibdir.

Hənəfilərə görə, dibləri dolaşıq və ya gur saçlar qalın yaxud möhkəm hörüldüyünə görə islanmazsa, su diblərinə nüfuz etməz. Ona görə hörüklərin açılması vacib olur.[330]

---

[326] Buxari , "Fəth-ul Bari", 1/358; Muslim, 1/267.
[327] "Bədai-us-sanəii", 1/5.
[328] Maidə 5/ 6.
[329] Muslim, 1/259-260.
[330] **Şafiiyə** görə, hörüyün özü dolaşmadıqda, onları açmaq vacib deyil. Əgər saçın ətraflarından bir saç belə yuyulmadan qalırsa, sonra onu kəsməklə və ya qopartmaqla götürsə, kifayət etməz, o yerlər yuyulmalıdır. Lakin yuduqdan sonra saçı götürmək başqa məsələdir. "Muğn-il muhtəc", 1/73; "Əl-Məcmu şərh-il-məhzəb".

Qadınlar namaz üçün azan və iqamə oxumazlar. Qadının azan oxunması məkruh sayılır.[331]

Fəqihlərə görə qadınlar üçün camaat məkruhdur, çünki qadınların camaat içinə çıxmaları bəzən fitnəyə səbəb olur.[332] Qadının qadına namaz qıldırması isə, caiz olsa da, məkruhdur.[333]

Qadının evdə təkbaşına namazı, məsciddə camaatla qılınan namazından daha əfzəldir. Bu barədə İmam Əbu Hənifə belə demişdir: **"Cavan qadının camaata gəlməsi məkruhdur. Qoca qadın isə fəcr, məğrib və işa namazı üçün çıxar. Çünki fasiqlər fəcr və işa vaxtı yatarlar, məğrib vaxtı isə yemək yeməklə məşğul olarlar".**

Mutəaxxir alimlərin[334] görüşünə görə (fətva verilən görüşdür), qadınların cümə və ya bayram namazlarında iştirakı, vaaz dinləmək və ya dərs almaq üçün məscidə getmələri, məkruhdur. Müasir zamanda açıq-aşkarda edilən günahlar və pozğunçuluğa görə, hətta qoca qadın gecə vaxtı ibadət üçün çıxsa da, məkruh sayılır. Hələ gənc qızların gecə vaxtı bəzənərək və ətirlənərək evdən çıxması barədə danışmırıq.

Qadının cümə namazı qılmasına gəlincə isə, İbn Şihəbdən (r.a) gələn rəvayətə görə, Peyğəmbər ﷺ buyurur: **"Cümə namazı, bu dörd nəfərdən başqa qalan hər müsəlmana camaat içində etməli vacib bir haqdır: kölə, qadın, uşaq və xəstə.[335]"** Peyğəmbərin ﷺ dövründən bu günə qədər bütün alimlər, qadına cümə namazının fərz olmadığı məsələsində ittifaq etmişlər.[336] Evində zühr namazını qılar və əvvəldə qeyd olunduğu kimi, bu daha əfzəldir.[337]

---

[331] "Fətəvayi Hindiyyə", 1/189.
[332] "Əl-Bədəiu", 1/315
[333] Məusili, "əl-İxtiyər", 1/ 207.

**Şafiiyə** görə, Aişə (r.a) və Ümmü Sələmənin (r.a) camaat qıldıqları üçün qadınların camaat namazı sünnətdir. Kişi onlara imamlıq etsin və ya qadın, fərq etməz. "Əl-Muğni", 2/176.

[334] Bir fiqh termini olub, "sonradan gələnlər" deməkdir. Əksi "mütəqaddimun"dur. Mütəaxxiruna "xələf", mütəqaddimuna "sələf" adı da verilmişdir. Bu fərq daha çox Əhli-Sünnət mənsubları haqqında istifadə edilmişdir. Mütəaxxirun ifadəsi, ümumiyyətlə **hicri üçüncü əsrdən və xüsusən beşinci əsrdən sonra gələn alimlər** haqqında işlənmişdir.
[335] Əbu Davud, Salət, 217; "Nəyl-ul-əutar", 2/352.
[336] İbn-ul-Huməm, "Fəth-ul qadir", 2/59.
[337] **Şafiiyə** görə, cümə namazının gerçəkləşməsinə qırx azad və ağıllı kişinin toplanması şərtdir. Az olub sayları qadınla, uşaqla, köləylə və ya onların bir neçəsi ilə tamamlanarsa, cümə namazı hamısından düşər. Qılsalar belə, səhih deyil. Yerinə zuhr namazı qılınar.

***Spirtli dezodorantlar və ətirlər dəztəmazlı ikən istifadə edildikdə ibadət etmək olarmı?***

Vücuda və ya paltara spirt vurma dəstəmazı pozmur. Dəstəmazın pozulması tamamilə insanın bədənindən bir şey çıxmasından asılıdır. Lakin insanın üzərində və ya paltarında nəcis bir maddə varsa, namaz qılması caiz deyildir. Məzhəbimizin imamlarına görə, nəcis olan spirt növündən olmadığı halda, dezodorant və ətirlər namaza mane olmur.[338]

Islamın qadağan etdiyi şey, “xamr” yəni sərxoş edici olan spirt növüdür. Lakin metil spirt kimi sərxoş etmə xüsusiyyəti olmayan bir şey haram deyildir. Buna görə istifadə edilən maddədəki spirt növü bilinməlidir.[339]

***Qadınlar şalvarda və ya pijamada namaz qıla bilərlərmi?***

Namazda geyilən paltarın bütün övrət yerini örtdüyü kimi altını göstərməyəcək şəkildə qalın, bədən xətlərini bəlli etməyəcək qədər də geniş olmalıdır.

Dərinin rəngini bəlli edəcək qədər incə və şəffaf bir paltarla qılınan namaz keçərli deyil və yenidən qılınmalıdır. Ancaq bədən xətlərini bəlli edəcək qədər dar şalvar, ətək və köynəklərlə qılınan namazlar hər nə qədər məkruh sayılsa da keçərlidir və yenidən qılınması lazım deyil.

***Nazik corabla namaz qılmaq olarmı?***

Qadının bədən xətlərini, saçını və ya dərisinin rəngini və altını göstərəcək qədər nazik bir paltar və ya qara olsa da, bədəni göstərən nazik corabla namaz qılması caiz deyil. Bu halda çölə çıxması heç caiz deyil.340

Qadın evdə namaz qılarkən pijaması və ya paltarı ayaqlarının üstünü örtəcək qədər uzun olmalıdır. Əgər bu geyimlər uzun olmasa, açıq qalan hissələr dərini göstərməyəcək corabla örtülərsə, bu da caiz olmaqla yanaşı savabı azdır. Dərini göstərən nazik corabla namaz olmaz. Çünki bu, yox hökmündə olan bir şeydir. Ən yaxşısı geniş və topuqlara qədər olan ətək və ya bir paltarla namaz qılmasıdır. Paltarın bədən xətlərini göstərəcək qədər dar olması, övrəti örtmədiyinə görə deyil, evdən xaricdə fitnə və təhrikə səbəb olduğuna görə haramdır.[341]

---

[338] Digər məzhəblərə görə onlar da nəcis sayıldığı üçün dəydikləri yeri yuyaraq namaz qılanlar daha ehtiyatlı davranmış olarlar.
[339] “Hanımlara fetvalar”, 1/24.
[340] “Fətəvayi Hindiyyə”, 1/206; Ö.N. Bilmen “İslam ilmihalı”, 110; “Kaynaklarla İslam Fıkhı”, 4/205.
[341] Celal Yıldırım “Kaynaklarıyla ahkam hadisleri”, 2/477.

Övrət sayılan üzvlərdən birinin hamısı və ya dörddə biri açılarsa namazı pozulur, dörddə birindən az açıq olarsa, namaz pozulmur. Məsələn, namazda baldırın və ya qulağın dörddə biri açılarsa, o qadının namazı pozulur.[342]

Bir qadın namaz qılarkən qeyri-iradi övrət yeri açılarsa və onu dərhal örtərsə, namazı pozulmaz. Lakin qiyam və ya rüku kimi bir rüknü əda edəcək qədər bir müddət örtməzsə, namazı olmazsa. Belə bir övrət açıqlığı namaz qılanın öz istəyilə olursa, namazı dərhal pozulur. Bu açıqlıq müddəti bir rüknü əda edəcək qədər davam edərsə, namazın səhhətinə mane olur.[343]

Bir qadın səcdə edən zaman övrət yerlərinin dörddə biri açılsa, səcdələri tərk edər.[344] İşarət ilə namaz qılar.

Qadınların camaatla deyil, tək-tək namaz qılmaları daha əfzəldir.[345]

Qadının belində kiçik bir uşaqla namaz qılması caiz olmaqla yanaşı, məkruhdur. Əgər uşağı qoruyacaq kəs olmaz və o da ağlayarsa, bu halda məkruh olmaz.[346]

### *Makiyajla namaz*

Makiyaj dəstəmazdan sonra edilmişsə və ya altına su keçirən maddələrdəndirsə və tərkibində təmizliyə mane olacaq hər hansı bir nəcis maddə yoxdursa, makiyajla namaz qılına bilər.

Qadının bəzənməsində caiz olmayan şey, pis və vücuda zərərli şeylərlə boyanıb makiyaj etməsi, zinətlərini ərlərindən və ya əmin olduğu məhrəmlərdən başqalarına göstərməsi, altına su keçirməyən bir boya və ya kosmetika işlədib onun üstündən dəstəmaz almasıdır.

Bu səbəblə dəstəmaz altına su çatmışsa, boyanın tərkibində nəcis bir maddə yoxdursa, onda namaza bir maneə mövcud deyil.

### *Namaz və musiqi səsi*

Aşağıda, yuxarıda və ya yaxın bir yerdə musiqi səsi eşidilirsə, namaz səhihdir. Lakin bu diqqəti yayındıracaq ölçüdə olarsa, savabını azaldır. Çünki Allah-Təala buyurur: **“Namazı Məni anmaq üçün qıl”** (Taha/14). Bu səbəblə bu cür şeylərdən çəkinmək və Uca Allaha layiqli şəkildə ibadət etmək lazımdır.

### *Hamilə qadın namazını oturaraq qılması*

Hamilə qadına və bətnindəki körpəyə ayaq üstə namaz qılmaq zərər verə biləcəksə, qadın namazını oturaraq qılar. Əgər rüku və səcdəyə getməkdə çətinlik çəkərsə, bu halda üzrlu sayılacağına görə onları işarətlə yerinə yetirər.

---

342 “Fətəvayi Hindiyyə”, 1/206; Ö.N. Bilmen “İslam ilmihalı”, 109.
343 “Fətəvayi Hindiyyə”, 1/206; Ö.N. Bilmen “İslam ilmihalı”, 110.
344 “Fətəvayi Hindiyyə”, 1/205.
345 “Fətəvayi Hindiyyə”, 1/297.
346 “Fətəvayi Hindiyyə”, 1/367.

Əgər həkim namazı ayaq üstə qılmasının təhlükəli olduğunu deyərsə, bu halda hamilə qadın namazlarını oturaraq qılar.

### *Bağda, bağçada və səfərdə qadının namazı*

Bildiyimiz kimi, namazın rüknlarından biri olan qiyam, fərzdir. Hətta vacib namazlarda da fərzdir. Ayaq üstə qılmağa gücü çatan bir qadın, oturaraq namazını qılarsa, bu caiz deyil, çünki fərz tərk edilmişdir. Bəs hansı hallarda oturaraq qılar?

1) Xəstəliyi və ya başqa bir üzürlü səbəbdən ayaqda durmağa heç gücü olmdığı halda.
2) Xəstəliyinin artdığı və ya şiddətli ağrıların olacağından qorxduğu halda.

Yuxarıda qeyd etdiyimiz məkanlarda kişilər görəcək və ya onlar var deyə, qadınlar namazını oturaraq qılmaz. Örtünmənin şərtlərinə riayət edərək, ayaq üstə fərz namazlarını qılar. Mümkün olduğu qədər qadınlar namazlarını evdə və ya qapalı məkanda qılsınlar. Sünnət və nafilə namazlar üçün isə, qiyam fərz deyil. Bunları oturaraq qılmaq caizdir, lakin fəziləti azalır.[347]

### *Divarlarda şəkil olan evdə namaz qılmaq*

Müqəddəs görülən və ya təzim göstərilən canlı şəkilləri asmaq, tövhid inancına uyğun olmadığı kimi, mələklərin də sevmədiyi bir şeydir. Müqəddəsləşdirmək məqsədi olmamaq şərtiylə, yonulub hazırlanmayan, düz səthli şəkillərin otağın arxa tərəfində və ya qiblə istiqamətində olmayan hissəsində asılmasında bir eyib yoxdur. Yəni şəkillər namaz qılınan yerin arxasında, sağında və solunda olması, namaza zərər verməz. Şəkil və ya bizi göstərən güzgü, namaz qılarkən qarşımızda - qiblə istiqamətində olarsa, məkruhdur.

---

[347] Faruk Beşer "Hanımlara özel fetvalar", 45.

## *V - Qadınların səfər əhkamları*

### *Əri və ya məhrəmi olmadan qadının səfərə çıxması*

Fiqh alimlərinin ittifaqıyla qadına təkbaşına səfər etməyi haramdır. Qadının məhrəmi və ya əriylə birlikdə olması labüddür .[348] Çünki, Peyğəmbər ﷺ buyurur**: "Allaha və axirət gününə iman gətirən qadına məhrəmi olmadan gündüz və gecə səfər etməyi halal deyil"**.[349]

Digər bir hədisdə İbn Abbasın (r.a) rəvayət etdiyinə görə: **"Qadın məhrəmi olmadan səfərə çıxmaz və ancaq məhrəmi hüzurunda naməhrəm biri kəs yanına gələr"**. Başqa bir hədisdə: "Bir kişi Peyğəmbərdən ﷺ soruşdu: "Ey Allahın Rəsulu, mən qoşuna qoşulmaq üçün çıxmaq istəyirəm, xanımım isə həcc etmək istəyir. O ﷺ belə buyurur: **"Xanımınla bərabər çıx."**[350]

Qadına məhrəmi və ya əri olmadan səfər etməsindəki qadağan, mühacir və əsir qadınlara şamil olunmur. Fiqh alimlərinin ittifaqıyla qeyri-müsəlman ölkəsində islamı qəbul edən qadın yanında məhrəmi olmasa belə, müsəlman ölkəsinə gedə bilər.

Lakin kafirlərə əsir düşdükdən sonra qadın qaçarsa, bu, səfər sayılmayacaq. Bu barədə Kəmal bin Əl-Humam belə demişdir: **"Çünki qadın müəyyən bir məkana getməyi niyyət etməmişdir. Əksinə məqsədi, fitnədən qorxub ordan xilas olmaqdırsa, o səyyahın qət etdiyi kimi, məsafə qət edər."**

Buna görə müsəlmanların bir əsgəri kimi, qadın əmin bir yer tapıb orda məskunlaşmalıdır. Sonra isə ancaq məhrəmi və ya əri ilə səfər edər. Müəyyən bir məkana niyyət etsə belə, niyyəti və səfəri sayılmır. Çünki belə vəziyyətdə olan qadının bir tək məqsədi, xilas olmaqdır. Bu halda səfər qadağanı batil olur.[351]

Səfərdə olan, rici talaqla boşanan qadın iddət saxlamalı olsa da, səfərə davam etməsi üçün ərinə tabe olar. Çünki nigahı, hələ də qaimdir yəni qüvvədədir.

Bain talaqla boşanan və ya əri vəfat edən qadının yaşadığı şəhərlə gedəcək yer arasında ən az səfər məsafəsi olarsa, şəhər və ya başqa məkan olmasından və yanında məhrəmi və ya məhrəmsiz olmasından asılı olmayaraq, səfərinə davam da edə də bilər, qayıda da bilər. Çünki bu səfərini yeniləmək deyildir. Ehtiyac olduğu halda, boşanan və əri vəfat edən qadına məhrəmiylə və ya başqa kəslə ən

[348] "Haşiyətu İbn Abidin", 1/146.
[349] Buxari, "Əl-Fəth", 2/566.
[350] Buxari, "Əl-Fəth", 4/72.
[351] "Fəth-ul-qadir", 2/331.

az səfər məsafəsi qədər səfər etməsi caizdir. Ancaq ər evinə iddət gözləməsi üçün qayıtması daha yaxşıdır.[352]

***Ərin zövcəsiylə başqa ölkəyə səfəri***

Qadın əri ilə başqa ölkəyə səfər etməyə imtina edərsə, bu imtinası məşru olmur. Eləcə də, evin ücrətini alana qədər qadın öz şəxsi evində zövcünə təslim olmaqdan (cinsi əlaqədən) imtina edərsə, bu hal da, məşru sayılmır. Çünki, ərin üzərində qadının nəfəqə haqqı var[353].

Qadının başqa ölkəyə səfər etmək imtinasıyla bağlı alimlərin fərqli görüşləri var:

1. Mutəqəddim fiqh alimlərinə görə, zövcənin əri ilə səfər etməsində imtina haqqı yoxdur. Çünki evlilik həyatının əsası, qadının kişi ilə birlikdə yaşamasıdır.
2. Mutəəxxir fiqh alimlərinə görə isə, qadınla səfər caiz deyildir. Çünki uzun səfər qadına zərər edir və ona sıxıntı gətirir. Ona görə də qadın ərin qohumları arasında olduğu vaxt, ona əziyyət edilməsi mümkün deyil. Lakin başqa ölkəyə səfər etdiyi zaman, qadına əziyyət olur və kimdənsə kömək istəməsi mümkün olmur[354].

Lakin İbn Abidin məsələ ilə bağlı belə demişdir: **“Belə məsələ müftiyə həvalə edilərək, ərin vəziyyətinə uyğun olaraq fətva verilir. Çünki hər məsələdə qadının xüsusi halı var. Ər və arvadın vəziyyətinə görə, məsləhət məşvərət edilərək fətva çıxarılır. Əri ilə səfər etməməyi qadın üçün fətva verildikdə, kişiyə qadın üçün nəfəqəsi vacib olur və qadının imtinası məşru olur. Əks halı da səhihdir”.**

---

[352] **Şafiiyə** görə, qadına vacibi həcc üçün güvəndiyi rəfiqəsiylə səfərə çıxması caizdir. “Muğn-il-muhtəc”, 1/467. Həmçinin, ər zövcəsiylə bərabər səfərdə olduğu halda, vəfat edərsə, qadına səfər etmək lazım deyil. “Haşiyətu əd-Dəsuqi”, 2/485.

[353] Vahbə Əz-Zuheyli, “əl-Fiqh-ul isləmiyyu va ədillətuhu”, 7/796; “Əl-Mufəssəl fi əhkəm-il mər’əti val-beyt”, 7/158; Muhamməd Əbu Zuhrət, “əl-Əhval-uş şəxsiyyəti”, s.275.

[354] Muhamməd Əbu Zuhrət, “əl-Əhval-uş şəxsiyyəti”, s.276.

## *VI- Yas tutan qadınların əhkamları*

Fiqh alimlərinə görə, səhih nigahdan olan vəfat iddətində, zifaf olmasa belə, yas tutma vacibdir. Çünki Allah Rəsulu ﷺ belə buyurur: **“Allaha və axirət gününə iman edən bir qadına ölən kəs üçün üç gün və üç gecədən artıq yas tutmaq halal deyil. Ancaq əri üçün dörd ay on gün yas istisnadır.”**[355]

Lakin ric’i talaqla boşanan qadın yas tutmamalıdır. Əksinə, boşanan qadından əri üçün bəzənməsi tələb olunur. Kim bilir, ola bilsin, Allah bundan sonra bir iş icad etsin.[356]

Ən kiçik[357] və ya ən böyük[358] bain talaqdan iddət gözləyən qadına gəlincə, nigah nemətini itirdiyi üçün ona yas saxlama vacibdir. Belə qadının halı, əri vəfat edən qadının halına bənzəyir.[359]

Qadına başqa qohumları üçün ancaq üç gün yas saxlamağı caizdir. Artıq günlər isə qadına yas haramdır. Buna dəlil Zeynəb bint Əbu Sələmənin rəvayətidir: “Ümmü Həbibəyə Əbu Süfyanın ölüm xəbəri gəldikdə (xəbərin) üçüncü günü sarı bir ətir gətirməyi buyurdu. Atasına yas tutmasının bitdiyini göstərmək üçün yanaqlarına və qollarına onu sürtdü və bunları söylədi: “Mənim buna ehtiyacım yoxdur”[360] Bununla o, ərindən başqa heç kəs üçün üç gündən artıq yas tutmaması barədə xəbər verən Peyğəmbərə ﷺ itaətini göstərdi.

Həmçinin, ər də, zövcəsinə qohumlarına yas saxlamağı qadağan etməlidir.

### *Qadının itkin düşmüş ərinə yas tutması*

Bildiyimiz kimi, itkin, xəbəri kəsilən, diri və ya ölü olması bilinməyən kəsə deyilir. Şər’i hökm isə, öldüyü təqdirdədir. Lakin fiqh alimlərinə görə, qadına hökm vaxtından vəfat iddəti gözləmək vacibdir.

Yas tutmağına gəlincə isə, fəqihlər vəfat iddəti gözləyən qadına yas tutmağın vacib olduğunu söyləmişlər.

---

[355] Buxari, Müslim, s.258, 259; Əbu Davud, 2/389; Nəsəi, 6/188.

[356] **Şafiiyə** görə, ric’i talaqla boşanan qadına qayıtmasına yəni əri ilə barışmasına ümidi qalmadıqda, yas tutmaq müstəhəb sayılır. “Əl-Haməl”, 4/458.

[357] Ən kiçik bain talaq, qadın birinci və ya ikinci talaqdan boşandıqda, iddəti bitənə qədər əri onu tərk edər və hələ ki, onu nigahına qaytarmaz.

[358] Ən böyük bain talaq isə, qadın üç talaqla boşandıqda, bu ən böyük bain talaq olur və ancaq digər bir kişi ilə evləndikdən (boşandıqdan) sonra keçmiş əri ona halal olar.

[359] “Fəth-ul-qadir”, 3/291.

**Şafiiyə** görə, bain talaqla boşanan qadına vacib olmasa da, yas tutmağı müstəhəbdir. “Əl-Umm”, 5/232.

[360] Muslim, “Səhih”, 2/1126.

### *Yas müddətinin başlanması*

Qadın ərinin vəfat xəbərini gec bilsə də, yas müddəti vəfat günündən sonra başlanır.

Bain talaqda isə, yas vaxtı, boşanma baş verən vaxtdan başlanır. Bunlar vəfat və boşanma məlum olduğu təqdirdədir.

Lakin qadından uzaqda ər vəfat edərsə və ya xanımını boşayarsa, onun yas müddəti vəfat və ya boşanma xəbərini öyrənən vaxtdan başlayır. Qadına ötürdüyü günləri yas günlərinə əlavə etməsi vacib deyil. İddəti qurtardığı gündən yas tutması da sona çatar.

### *Yas tutan qadın nələrdən çəkinər*

Yas tutan qadın şəriətə və ya örfə görə bədənə və ya paltara zinət verən bütün əşyalardan çəkinər. Eləcə də, dul qadına evlilik məqsədiylə baxmaq, onun yaşadığı yerdən çıxması və elçiliyə namizədlərlə danışması kimi əməllərdən uzaq durar.

Araşdırma vaxtı ixtilafların örfü ixtilaflardan meydana gəldiyini görürük. Çünki örfdə zinət sayılanlar, şəriətə görə haramdır və mübah sayılanlar isə, şər'ən mübah deyil. Bütün qadağanlar, bədən üçün istifadə olunan vasitələrə, paltarlara, bəzək əşyalarına, elçiliyə namizədlərlə danışmağa və evlə bağlı məsələlərə aiddir.

***Bədən üçün istifadə olunan vasitələr***:

Zinət sayılan ətir, saç boyama və sürmə kimi cəlbedici vasitələr yas tutan qadına haramdır. Bunlardan hər birinin istifadəsində zinət təzələnir. Lakin qadının müalicə üçün işlətdikləri buna daxil deyil.

Fəqihlər diş fırçasıyla dişləri fırçalamaq ətir sayılmasa da, ondan istifadə etməyin kərahət olduğunu söyləmişlər. Çünki onlara görə, bu zinətdən sayılır.[361]

Eləcə də, yas tutan qadının istifadə etdiyi yağlar, qadağan olmuş zinətdəndir.[362]

Ümmü Sələmədən (r.a) rəvayət edilən hədisə görə: "Peyğəmbər ﷺ əri Əbu Sələmə vəfat etdiyi vaxt Ümmü Sələmənin (r.a) yanına daxil olub ona saçlarına ətir, xına sürtməsini qadağan edir. Çünki onlar boyadırlar - buyurur. Ümmü Sələmə (r.a) soruşur: "Bəs nə ilə darayım? O ﷺ buyurur: **"Sidr yarpaqlarını istifadə et"**[363] yəni örtüyə bənzəyən sidr yarpaqları ilə başını ört.

---

[361] **Şafiiyə** görə, ancaq ətir ticarəti edən və ya onu istehsal edən qadına ətrə toxunmaq caizdir. "Əl-Məcmu lin-Nəvəvi", 17/30.

[362] "Fəth-ul-qadir", 14/162, 163; "İbn Abidin", 2/617-619.

[363] "Sünən Əbi Dəvud", 2/391, 392.

*Paltarlar*:

Qeyd etdiyimiz kimi, bütün örfdə olan geyimlərin rənginə diqqət yetirilməsə də, zinət sayılır. Bəzən qara paltar qadının gözəlliyini artırdığı halda, qadağan edilir. Eləcə də, öz xalqının örfünə görə zinət geyimlərindən sayılır.

Lakin ətir verən bitkilərlə boyanmış paltarların qadağanı barədə hədislər gəlmişdir: **"Bizə ölü üçün üç gündən artıq yas tutmaq nəhy edildi, ancaq əri vəfat etdikdə, dörd ay və on gün yas tutulur. Eləcə də sürmə, ətir və rəngli paltar da nəhy edildi."**[364]

***Bəzək əşyaları:***

Fiqh alimlərinə görə, yas tutan qadına hər şəkildə bəzək əşyaları haramdır. Qadına ərinin vəfatını bilən vaxtdan onları çıxarmaq lazımdır. Çünki Peyğəmbər ﷺ buyurur: **"Sarımtıl və ya narıncı rəngə boyanmış paltar geyinməyin və bəzək əşyaları taxmayın"**. [365] Bu məsələdə sırğa, üzük, bilərzik və bənzər cəvahiratdan olan bəzək əşyaları arasında fərq yoxdur. Fil sümüyündən və digər qızıl, gümüş olmayan bəzək əşyalarını isə istifadə edər.[366]

Yas tutan qadının elçiliyə namizədlərlə hər hansı vasitələrdən biriylə yəni işarəylə və ya açıq danışması haramdır.

Qadının ancaq bir ədəd qadağan olunan paltarı varsa, başqa paltar tapana kimi onu geyinmək qadına haram deyil. Çünki "sətrul-aurət" yəni övrətini örtmək, yas tutmaqdan daha vacibdir.

***Yas tutan qadına mübah olan şeylər***

Həm boşanmış qadının, həm də əri vəfat etmiş qadınım iddət saxladığı müddətdə ehtiyaclarına görə günorta evdən çıxması barədə Cabirdən (r.a) belə hədis rəvayət edilmişdir: "Xalamı əri üç talaqla boşamışdır. Xalam xurmalarının meyvəsini kəsmək istədikdə bir adam onu evdən çıxmağını qadağan etdi. Xalam da Peyğəmbərə ﷺ gəlib vəziyyəti danışdı. Allah Rəsulu ﷺ: **"Xurmalarını kəs, ondan istərsən sədəqə verərsən və ya xeyirli bir işə sərf edərsən"** buyurdu."[367]

Yas tutan qadın başqasının evində gecələməz, ancaq zərurət halında gecə evdən çıxar. Çünki gecə, gündüzdən fərqli olaraq, fəsad zamanıdır. Gündüz isə, ehtiyacların qarşılanması, alınması və dolanışıq üçün bir vaxtdır.

---

[364] "Bədəi-us sanəi lil Kəsəni", 3/208; "Əl-Fətəva-l-hindiyyə", 1/533, 534, 557.
[365] Əbu Davud, 2/391; Nəsəi, 203.
[366] **Şafii** alimi Əl-Ğəzaliyə görə, qadına gümüş üzük taxmaq istisna olub mübahdır.
[367] "Nilul əutar", 7/97.

Yas tutan qadına iddəti vaxtı aşağıda gələnləri etmək mübahdır:[368]

1. Paltar qiymətli olsa belə, ətri olmayan rənglə boyanan bir paltar geyinmək;
2. İstənilən rəngdə, örfə görə zinət olmayan hər bir paltar;
3. Qadın, evin yatağını, əşyalarını, pərdələrini və oturacaqlarını bəzəyə bilər;
4. O, paltarını yuya bilər və bədən gigiyenasını yəni qoltuq altını qırxar, dırnaqlarını kəsər və s. kimi təmizlik işlərini görə bilər;
5. Qoxusuz sabunla başını və əllərini yuya bilər.

Yas tutan qadına zinətlərini göstərmədiyi və təkbaşına qalmadığı müddətcə, qarşılaşmağa ehtiyacı olan bəzi büluğ yaşındakı kişilərlə görüşməyi gizli sayılmaz.

### *Yas tutan qadının həcc etməsi*

Vəfat iddəti vaxtında yas tutan qadın həcc üçün çıxmamalıdır. Çünki həcc keçici bir vəziyyət deyil, iddət isə müvəqqəti bir müddətdir. Bu barədə Səid bin Museyyibdən belə rəvayət gəlmişdir: **"Həcc və ümrə edən qadınların ərləri vəfat etmişdirlər. Ömər (r.a) onları iddət müddətləri bitənə qədər Zil-Halifədən evlərinə qaytarmışdır".**[369]

Qadın həcc üçün çıxandan sonra əri vəfat edərsə və o evdən yaxın məsafədədirsə (yəni namazı qısaldacaq məsafadən az olduqda), iddətin bitməsini gözləmək üçün qayıdar. Çünki həmin qadın səfəri hökmündə deyil. Qayıtdığı vaxtdan bəri, qalan iddət müddətini öz mənzilində keçirər.[370]

Əgər qadın qasr (90 km) və daha çox məsafəni qət edib uzaqlaşarsa, səfərinə davam edər. Çünki qayıtmaq onun üçün məşəqqətli olar və buna lüzum yoxdur. Qayıtdığı halda təhlükələrə məruz qalmaqdan qorxarsa, yaxın məsafədə olsa belə, səfərinə davam edər. Çünki qayıtmaq ona zərərli ola bilər.[371]

Ərinin ölümündən sonra qadın ihrama girərsə, orda iqamət etmək zimmətində qalar. Çünki iddəti həccdən əvvəl baş vermişdir.[372]

### *Təziyə və yas  mərasiminin keçirilməsi*

Fəqihlərə görə, matəm məkruh sayılır.[373] İbn Abidin isə "Əl-İmdəd" kitabından nəql edərək belə demişdir: **"Bir çox mütəaxxir alimlərimiz ev sahibinin yanında toplaşmağın və başsağlığı verənlər gələnə kimi evdə**

---

[368] "Haşiyətu İbn Abidin", 2/618.
[369] İmam Malik, "Əl-Muvatta", s.406.
[370] "İbn Abidin", 2/600-670.
[371] "Fəth-ul-qadir", 3/298.
[372] Qayıtmaq, yeni səfər vasitələri və hallarına görə  çətinləşir.
[373] "Haşiyətu İbn Abidin", 1/604.

**oturmağın məkruh olduğunu söyləmişlər. Əksinə dəfndən qayıdan insanlar ayrılıb öz işləriylə, ev sahibi də öz işiylə məşğul olsun”**.[374]

Eləcə də, məsciddə yas məclisi də məkruhdur.[375] “Xazənət-ul fətəva” kitabında kişilər üçün yas zamanı məclis üç gün rüxsət olaraq gəlmişdir. Lakin qadınlara qətiyyən məclisdə oturmamaları qeyd olunmuşdur.[376]

### *Meyyitin üzərində qışqırmaq, ağlayıb fəryad etmək*

Ölünün evində, cənazədə və başqa bir məkanda qışqırmaq və fəryad etmək məkruhdur. Lakin ağlayıb göz yaşı tökməyin bir eybi yoxdur.

Səbr etmək isə, daha əfzəldir.[377] Səbr haqqında isə, belə bir hədis gəlmişdir: “Peyğəmbər ﷺ qəbrin yanında ağlayan bir qadını görür və buyurur: **“Allahdan qorx və səbr et”**.[378] Qışqırıb fəryad etməyin kərahətindən məqsəd, təhrimən məkruh olmasıdır.

Əbu Musa əl-Əşaridən isə belə hədis rəvayət edilmişdur: **“Peyğəmbər ﷺ saçını yolan, üstünü başını yırtan qadınlardan uzaqdır”**.[379] Digər bir hədisdə: **“**(Ölünün arxasından ağlayıb) **yanaqlara vuran, yaxaları yırtan və cahiliyyət duasıyla dua edən kəs bizdən deyildir” –** nəql olunur.[380]

Səssiz ağlamaq isə, caizdir. Çünki, bir hədisdə belə gəlmişdir: “Peyğəmbər ﷺ qalxıb qızının yanına getdi. Uşağı Allah Rəsuluna ﷺ verdilər, qucağına götürdü. Körpə çox çətin nəfəs alırdı. Allah Rəsulu ﷺ gözlərindən yaş töküldü və belə buyurdu: **“Bu, Allahın, bəndələrinin qəlbinə qoyduğu mərhəmət hissidir”**.[381]

Ömər (r.a) Xalid bin Vəlidin (r.a) xanımları barədə belə demişdir: **“Qadınları burax, qoy səssizcə Əbu Süleymana** (Xalid bin Vəlidə) **ağlasınlar”**.[382]

**“Həqiqətən ev əhlinin ölü üçün ağlaması, ona əzab gətirir”**[383] hədisində ağlamaqdan məqsəd, yas tutub fəryad etmələridir. Belə şeyin vəsiyyət edilməsi də, ölüyə əzab gətirir.[384]

---

[374] “Həşiyətu İbn Abidin”, 1/604.
[375] “Ğunyət-ul-Mutəməlli fi şərhi Munyət-il-musalli”, s.608; “Haşiyətu İbn Abidin”, 1/603.
[376] “Haşiyətu İbn Abidin”, 1/603-604; “Əl-Bəriqat-ul Məhmudiyyə fi şərh-it-tariqati Məhmudiyyə”, 4/168.
[377] “Əl-Hindiyyə”, 1/157; “Məraq-il-fələh”, s.305.
[378] Buxari, “Fəthul-bəri”, 3/125; Müslim, 2/637.
[379] Buxari, “Fəth-ul-bəri”, 3/165; Müslim, 1/100.
[380] Buxari, “Fəthul-bəri”, 3/166; Müslim, 1/99.
[381] Buxari, “Fəthul-bəri”, 3/151; Müslim, 2/636.
[382] Buxari, “Fəthul-bəri”, 3/160, 161; Beyhaqi, 4/71.
[383] Buxari, “Fəthul-bəri”, 3/125; Müslim, 2/638.
[384] «Əd-Dər va İbn Abidin”, 1/633.

### *Ölü üçün Quran qiraəti və savabını ona hədiyyə etmək*

**Ö**lü üçün Quran oxuyub savabını ona hədiyyə etmək, caizdir. İbn Abidin "Əl-Bədəiu"dan nəql edərək belə demişdir: **"Başqası üçün edilən bir əməlin niyyətiylə özün üçün edilən əməlin niyyəti arasında fərq olmadığı kimi, ölüyə və ya diriyə edilənlər arasında da fərq yoxdur. Etdikdən sonra savabı başqasına hədiyyə edilə bilər."**

### *Qəbir ziyarəti*

Fiqh alimlərinə görə, kişilərin qəbirləri ziyarət etdikləri kimi, qadınların da ziyarət etmələrini söyləmişlər. Çünki, Peyğəmbər ﷺ buyurur: **"Həqiqətən mən sizi qəbirləri ziyarət etməkdən nəhy etmişdim. İndi Muhammədə anasının qəbrini ziyarət etmək izni verildi. Siz də qəbirləri ziyarət etdiniz, çünki qəbir ziyarəti sizə axirəti xatırladır"**.[385]

[385] Müslim, 2/672; Əhməd, 3/355.

## *VII - Gözəllik üçün cərrahi və bənzəri əməliyyatlar*

### *Qulaqların deşilməsi*

Fiqh alimləri sırğanın bağlanması üçün kiçik qızın qulağının deşilməsini caiz görmüşlər. İnsanlar onu Peyğəmbərin ﷺ vaxtında etmişlər. Belə ki, İbn Abbasdan (r.a) rəvayət olunan hədisdə Allah Rəsulu ﷺ iki rükət bayram namazı qıldı. Ondan əvvəl və sonra başqa namaz qılmazdı. Sonra Bilal (r.a) yanında ikən qadınlar gəldi və onlara sədəqə etməyi buyurdu. Bir qadın da sırğasını çıxarıb sədəqə verdi.[386]

### *Dişlərin itilənib incəlməsi və bədənə döymə etdirmək (tatuaj)*

Gözəllik üçün cərrahiyə növlərindən biridir. Bu barədə gələn hədisə görə: "Peyğəmbər ﷺ buyurur: **"Allah Onun yaratdığını gözəllik üçün dəyişdirib döymə edən və etdirən, üzünün tükünü çıxaran və çıxartdıran və dişlərini itilətdirib incəldən qadınlara lənət etmişdir".**[387] Digər rəvayətdə isə: **"Allah Rəsulu ﷺ dişi itiləyib seyrəltməyi qadağan etmişdir".**

Qurani-Kərimdə Allahı tərk edib şeytanı özünə dost tutan şəxs barədə belə buyrulur: **"Və Allahın yaratdıqlarını dəyişdirməyi əmr edəcəyəm!"**[388]

Ibn Abidin demişdir: **"Üzün tüklərini çıxarmağın qadağan edilməsi, naməhrəm kişilər üçün bəzəndiyi təqdirdədir. Lakin zövcü xoşlamadığına görə üzündəki tükləri götürmək haram olmaz. Çünki qadınların zinətlənməsi, arzu olunandır".** Sonra belə qeyd etmişdir: **"Qadında saqqal və bığ çıxdıqda, onları təmizləmək haram deyildir. Əksinə müstəhəbdir. Qaş və üz tükləri qadın cizgilərinə bənzəmədikdə, götürməyin eybi yoxdur".**[389]

### *Artıq bədən üzvlərinin kəsilməsi*

İnsanın həlakına səbəb olmadığı halda, artıq barmağın və ya əlavə diş kimi bir üzvün kəsilməsi caizdir. Lakin Qurtubi İyaddan belə nəql etmişdir: **"Kim artıq barmaq və ya əlavə bədən üzvüylə yaranmışsa, ona bu üzvü kəsmək və ya çıxarmaq caiz deyil. Çünki bu Allahın yaratdığını dəyişdirməkdir"**.[390]

---

[386] Buxari, "Fəth-ul-bəri", 2/466-467.
[387] Müslim, 3/1678; Əhməd, "Müsnəd", 6/22.
[388] Nisa 24/119.
[389] "İbn Abidin", 5/239.
[390] "Əl-Fətəval-Hindiyyə", 5/360.

## *VIII - Bədən gigiyenası*

### *Qadının üz gözəlliyi*

Qadının üzünü gözəlləşdirməsi, üzün bəzi yerlərində bitən tükləri təmizləməklə olur. Fəqihlərə görə, ona müstəhəbdir ki, tükləri götürsün. Eləcə də, qadına əlinin, ayağının, kürəyinin və qarnının tüklərini götürmək caizdir.[391]

### *Ülgüclə bədən tüklərinin təmizlənməsi*

Sünnədə ülcüklə tüklərin təmizlənməsi, məşru bir əməldir. Buna dəlil, Səid bin Musəyyib Əbu Hureyrədən (r. a) rəvayət etdiyi hədisdir: "Allah Rəsulu ﷺ buyurmuşdur: **"Peyğəmbərin sünnəti, beş şeydir. Sünnət olmaq, qasıqları qırxmaq, dırnaqları kəsmək, qoltuq altını təmizləmək və bığların uclarını kəsmək"[392].** Fəqihlərə görə, kişi üçün qırxmaq, qadın üçün isə tükləri almaq sünnətdir.[393]

### *Ülgüclə təmizləməyin vaxtı*

Qırx gün tük təmizləməyi tərk etmək məkruhdur. Çünki, Ənəsin (r.a) rəvayət etdiyi hədisə görə: **"Allah Rəsulu ﷺ bığları qısaltmağı, dırnaq kəsməyi, qoltuqaltı və qasıq tüklərinin qırxmasını qırx gündən çox uzatmamağı buyurmuşdur"[394]**.

Daha dəqiq desək, bu məsələ vəziyyətə, şəxsə, zamana və məkana görə dəyişir. Lakin səhih hədisdə gələn vaxta görə, qırx günü aşmamalıdır. [395].

Bildiyimiz kimi, qadın və ya kişiyə, zəruri haldan başqa naməhrəmə övrətini göstərməyi haramdır. Ülgüclə tüklərin təmizlənməsində başqalarından kömək istəməyə gəlincə isə, övrət yerini qırxa bilməyən və ya tük tökən vasitəylə təmizləyə bilməyən kəs, qasıq tüklərini zəruri halda başqasına təmizlətdirər.[396]

### *Ülgüclə qırxmağın ədəbləri*

Ülgüclə təmizləmənin ədəblərinə gəlincə, qasıq yerlərini qırxarkən göbəyin altından başlamaq müstəhəbdir. Eləcə də sağ, sonra sol yanlarını qırxmaq müstəhəbdir. Həm də, tükləri hamama və ya suya atmayıb gizlətmək,

---

[391] Tükləri təmizləməyi əri buyurarsa, **Şafiiyə** görə, qadına vacibdir. "Haşiyətu Qalyubi", 3/252.
[392] Buxari və Tirmizi rəvayət etmişdir.
[393] **Şafiiyə** görə, cavan qadın tükləri alar, yaşlı qadın isə qırxar. "Əl-Muğni", 1/86.
[394] "Fəth-ul-bəri", 10/284; Tirmizi, "Tuhfət-ul-Əhvazi", 8/38; Müslim, 1/222.
[395] "Fəth-ul-Bəri", 10/284; "İbn Abidin", 5/261; "Əl-Hindiyyə", 5/357.
[396] "Bəhr-ur-raiq", 8/219.

götürülən tüklər və dırnaqların torpağa basdırılması müstəhəbdir.[397] Xiləl Mu’məl bint Məşrəhin rəvayət etdiyinə görə: **“Atamı dırnaqlarını kəsdiyini və onları basdırdığını gördüm. O: - “Peyğəmbərin ﷺ belə etdiyini gördüm”** - söylədi”.[398]

---

[397] “Əl-Fətəval-hindiyyə”, 5/358.
[398] “Əl-İsabətu li İbni Hacər”, 3/421.

## *IX - Saçlarla bağlı əhkamlar*

### *Qadının saçını qırxması*

Zərurət olmadan qadına saç qırxmaq caiz deyil. Çünki, Əbu Musadan (r.a) rəvayət olunan hədisdə: **"Allah Rəsulu ﷺ vaveyla deyən, saçını yolan, üstünü başını yırtan qadınlardan uzaqdır"** buyrulur. Həmçinin, rəvayət olunan digər hədisdə Peyğəmbər ﷺ qadının başını qırxmasını nəhy etmişdir.[399]

Lakin qadın başını üzrlü səbəbə və ya ağrı olduğuna görə qırxarsa, bir eybi yoxdur.[400]

### *Saçların kəsilməsi*

Qadının saçını qısaltması caiz, qırxması isə, yuxarıda qeyd olunduğu kimi, bir üzr olmadan qadağan edilmişdir. Həccdə ihramdan çıxarkən, qadınlardan saçlarını, dörddə birini kəsərək qısaltlamaları istənilmişdir. Çünki, Peyğəmbər ﷺ buyurmuşdur: **"Kişilərə qırxma, qadınlara qısaltma vardır"**.[401]

Qadınların kişilərə bənzəməsi qadağan edildiyinə görə, qadın saçlarını, kişi saçına bənzəyəcək şəkildə qısaldarsa, haram olur. Qadın ilə kişinin saç şəkilləri də bir-birindən fərqlənməlidir.

Qadının saçlarını qadın bərbərinə qısaltdırmasına gəlincə, bunu kişilərə görünmək üçün edirsə, kimə qısaltdırmasından asılı olmayaraq, haramdır. Qadın bərbəri gördüyü qadınları ərinə və ya başqasına bəhs etməyən, dürüst, əxlaqlı və müsəlman bir qadındırsa, yuxarıda qeyd etdiyimiz kimi, kişi saçına bənzətmədən, qısaltması caizdir. Çünki qadın övrətini "öz qadınları" yəni məhrəm qadınları xaricində, başqa qadınlara da göstərməz.

### *Saçları təpəyə toplayıb dəvə donqarı kimi etmək*

Mövzu ilə bağlı belə hədis gəlmişdir: "Peyğəmbərimiz ﷺ belə buyurur: **"Cəhənnəm xalqından iki sinif insan var ki, mən hələ onları görmədim. Bunlardan bir qrupunun əllərində inək, öküz quyruqlarına bənzər qamçılar (dəyənəklər) vardır ki, onlarla insanları döyərlər. Digər qrup isə paltar geydikləri halda çılpaqdırlar. Kişilərə meyl edərlər, onları da özlərinə meyl etdirirlər. Başları əyilmiş dəvə donqarına bənzəyər. Bunlar nə cənnətə girər, nə də onun qoxusunu alarlar. Lakin cənnətin qoxusu bu qədər uzaq məsafədən alına bilər"[402]**.

---

[399]Tirmizi, 3/248.
[400] **Şafiiyə** görə isə, kərahətdir. "Əl-Muğni", 1/90.
[401] Əbu Davud, Mənəsik, 78; Nəsəi, Zinət, 4; Tirmizi, Həcc, 75.
[402] Muslim, Libas, 125.

Göründüyü kimi, hədisi-şəriflərdə **"dəvə donqarı kimi saçları bağlamağın münasib olmadığı"** ifadə edilmişdir. Qadınların başlarının dəvə donqarlarına bənzədilməsi, müxtəlif bant və sarğılarla sarıyıb onları böyütdükləri üçündür. Saçların dəvə donqarına bənzədilməsi, saçları açıq vəziyyətdə və ya örtülü olan qadınların onları toplayıb yuxarıdan yəni təpədən bağlaması şəklində də başa düşülə bilər. Açıq olan qadınlar saçlarını belə yığarlarsa, daha böyük günah etməklə yanaşı, qapalı olan qadınlar da buna diqqət etməlidirlər. Çünki hədisdə, **"başlarındaki saçlarının dəvə donqarı kimi olması"** ifadəsi çox açıqdır. Saçlarını başlarının üzərində toplayıb tam dəvə donqarı görünüşünü vermək, başı açıq qadınlar kimi başı örtülü qadınlar üçün də söyləmək olar.

Ancaq hədisdə **"geydikləri halda çılpaqdırlar"** ifadəsinin başını islama görə örtməyən açıq-saçıq geyinən qadınlarla bağlı olduğunu düşünmək daha məqsədəuyğun olar. Lakin başı bağlı olduğu halda, sadəcə örtüyün altından verilən bir saç şəklinin də bu qədər təhlükəli olmasını düşünürük.

Bununla yanaşı, alimlərin bundan əsrlər əvvəl də bəzi belə halların olduğunu söyləmələri, bu hökmün başı bağlı qadınlara da aid ola biləcəyini göstərir.

Belə ki, hicri 676-cı ildə vəfat edən İmam Nəvəvi: **"Bu gün bu iki sinfın ikisi də mövcuddur"** deyir və **"bunların bir hissəsini örtdükləri halda, digər tərəfını açıq saxlayan yaxud islamın əmr etdiyi baş örtüyünün şəklinə uyğun olmayan şəffaf, incə paltarlar geyənlər nəzərdə tutulur"** kimi açıqlayır.[403]

### *Saça saç əlavə etmək və parik taxmaq*

Qadının saçına nəcasətli sün'i saç və ya insan saçını birləşdirməsi, məkruhdur. Buna dəlil **"Allah saçlarına saç əlavə edən və əlavə etdirənə, döymə edən və etdirən qadınlara lənət etmişdir"**[404] hədisidir.

Saçlarına saç əlavə etdirən qadın, başqa qadın tərəfindən məcburi olaraq bunu edir. Saç əlavə edən qadın isə, öz istəyilə saçına saç əlavə edən qadındır. İnsan saçından faydalanmağın haramiyyəti, Adəm oğlunun kəramətli olmasına görədir. Əslində saç kəsildikdə və ya töküldükdə qadın öz saçını torpağa basdırar. Amma başqa insanın saçı olduqda, o saç təmiz sayılır.[405]

### *Qadınların saçlarını rəngləməsi*

Ağ saçlara xına və ya bənzəri bir rəng qoymaq, kişiyə müstəhəb olduğu kimi, qadına da müstəhəbdir. Bu barədə səhih hədislər var. Saç rəngləmə, evli qadınlara aid olub, ihram vaxtından başqa, hər vaxt edilə bilər. Çünki saç rəngləmə bir zinətdir, zinət isə ərin zövcəsindən istədiyi bir şeydir. Qadına

---

403 Nəvəvi, "Şərh-ul Muslim", 14/110.
404 Buxari, "Əl-Fəth", 9/374.
405 **Şafiiyə** görə, qadın evli olmadıqda, saç əlavə etmək haramdır. Lakin qadın evli olarsa, zövcünün izniylə saç əlavə etmək caizdir, əks halda haramdır. "Raudat-ut-talibin", 1/276.

ərinin izniylə yanaqlarını allandırmaq və barmaqların uclarını xınayla qara qarışıq bir rənglə rəngləmək caizdir.[406]

Evli qadının əllərini rəngləməyin müstəhəb olması, Peyğəmbərin ﷺ zövcələrindən birinin rəvayət etdiyi hədisdən gəlir: “Allah Rəsulu ﷺ ilə iki qibləyə namaz qılırdıq. Yanıma daxil olan zaman, əllərimin boyanmadığını gördü və buyurdu: **“Məgər istəyirsən ki, sənin əllərin kişi əllərinə oxşasın. Əllərini boya”.** Ondan sonra əllərimi ölənə qədər boyadım.” Allah Rəsulunun ﷺ zövcəsi vəfat edən vaxt səksən yaşı vardır.

Evli olmayan qadına gəlincə isə, fitnə qorxusu olarkən və ehtiyac olmadığı halda, ona əllərini və ayaqlarını xınayla rəngləmək kərahətdir. Yanaqları allandırmaq və barmaq uclarını xınanı qara rəng birlikdə boyamaq isə, haramdır.

### *Saçını boyayan qadının dəstəmazı və qüslu*

Dəstəmaz və ya qüsl üzvləri üzərində bir maddənin mövcudluğu, suyun dəriyə çatmasına mane olarsa, bu, dəstəmazın və qüslun səhihliyinə bir maneədir.

Xına qoyan kəsin isə dəstəmaz və qüslu səhihdir. Çünki xına yuyulub təmizləndiyinə görə onun bir tək rəngi qalır. Bir tək rəng də suyun dəriyə çatmasına maneçilik etmir və dəstəmazın və ya qüslun səhihliyinə də təsiri yoxdur.[407]

### *Mualicə üçün xına ilə rəngləmə*

Müalicə üçün xına çəkmək caizdir. Çünki, Peyğəmbər ﷺ xanımı Səlmadan (r.a) rəvayət olunan hədisə görə: “Allah Rəsuluna ﷺ bir kəs başından şikayət etdikdə, buyurardı: **“Get hicəmə et”,** ayağından şikayət etdikdə isə: **“Get xına çək”**. [408] Digər bir hədisdə isə, Səlma (r.a) dedi: **“Peyğəmbərə ﷺ qulluq edirdim, bədənimdə yara vardır. Mənə onun üzərinə xına çəkməyi buyurdu. Sonra yaradan heç bir ləkə qalmadı.”**[409]

### *Tərkibində nəcasət olan bir boya və nəcasətin özü ilə rəngləmə*

Tərkibində nəcasət olan bir boyanı üç dəfə yumaqla, qadının saçları və ya hər hansı bir bədən üzvü təmizlənir.

Nəcasətin özüylə rəngləməyə gəlincə isə, o, ancaq özünün, dadının və qoxusunun getməsiylə və yumanın sonunda təmiz suyun çıxmasıyla təmizlənər. Rənginin qalmasına güzəşt edilir. Çünki təmizlənməsi çətin olan ləkənin qalması zərər etmir.

---

[406] “Kitəb-ul-furu va təshihuhu”, 2/353, 354.
[407] “Şərh-ul Hatab”, 1/163.
[408] “Kitəbul furu”, 2/356; “Aunul məabud”, 4/2.
[409] “Əl-Furu”, 2/354.

İçində qan olan rəng də nəcisdir. Damarında qan axan, quruda yaşayan soxulcan və qurdla olan rəng isə, içində qanı donan ölü bir maddədir və nəcisdir.[410]

Müasir dövrümüzdə istifadə edilən kimyəvi saç boyalarına gəlincə, burda diqqət ediləcək məsələ, həmin boyanın suyu keçirib keçirməməsidir. Çünki kimyəvi saç rəngləri dəri üzərində su keçirməyən bir təbəqə əmələ gətirir. Bu da qüsla mane olduğuna görə caiz deyildir. Bitki mənşəli, təbii saç boyalarında bu hal olmadığından istifadəsində bir eybi yoxdur[411].

### *Heyzli qadının boya çəkməsi*

Heyzli qadının boyanması caizdir. Çünki, rəvayət olunan hədisdə bir qadın Aişədən (r.a): **"Heyzli qadın boyana bilərmi?** – deyə soruşur. O (r.a) da belə dedi**: "Biz özümüzə rəng çəkmiş halda Peyğəmbərin ﷺ yanında idik və bizə bunu qadağan etmədi"**[412]. Digər bir hədisə görə: **"İbn Ömərin xanımları heyzli halda ikən boyadan istifadə edirdilər".**[413]

---

[410] "Haşiyətu İbn Abidin", 1/219.
[411] İbn Abidin, "Raddul-muxtər", 1/288.
[412] İbn Macə,1/215.
[413] "Sunən-ud-Dərimi", 1/252.

# *X - Müasir fətvalar*

## *Müxtəlif məzhəblərdə olan ər və zövcənin vəziyyəti necə olacaq?*

Ər və zövcənin fərqli məzhəblərdə olması, onlar üçün əməldə bəzi çətinliklər meydana gətirə bilər:

1. Fərqli məzhəb görüşləri əməldə bəzi yanılmalara səbəb ola bilər.
2. Belə cütlüklər bilmədikləri məsələlərdə təkbaşınadırlar.
3. Eyni məzhəbdə olan ər və zövcənin əməl etdiklərindən meydana gələn asanlıqlardan məhrumdurlar

Bununla yanaşı, ər və zövcənin eyni məzhəbdə olmaları və ya bir-birinin məzhəblərinə tabe olmaları şərt deyil. Birinin digərini məcbur və təlqin etməsi doğru deyildir. Hər birinin haq məzhəbdə olması kifayət edir.

Məzhəb seçərkən, zövclərin bir-birinə qarşı hər hansı bir məsuliyyəti yoxdur. Qadın məzhəb seçimində sərbəstdir, "qadının ərinə tabe olması əfzəldir" demək, düzgün deyil.

Lakin ən rahat tətbiq edilən və ya ən çox üstünlük verilən və öyrənilən ortaq bir məzhəb seçilə bilər.

## *Qadının maşın sürməsi*

Qadının evdə qalması daha əfzəldir. Ona ərin icazəsi olmadan və hicaba riayət etmədən evdən çıxmasına icazə verilmir.

Zəruri və məcburi hallarda (şəriətə uyğun olaraq) qadına ən az 78 km məsafəyə qədər, aşağıdakı şərtləri yerinə yetirməklə, maşın sürməyə icazə verilir:

1) Başqa alternativin olmaması;
2) Həyatı /namusu üçün aşkar təhlükənin olmaması;
3) Hicaba riayət etməsi.[414]

Qadına sadalanan şərtlərdən biri belə olmadan, maşın sürməsinə icazə verilmir.[415]

---

[414] "əl-Əşbəh van-nəzair", 252; "İdərat-ul Quran".

[415] "Müasir fətvalar", Müfti Süheyl Tarməhəmməd, Müfti İbrahim Desainin rəhbərliyi ilə, s.393.

***Döymə etdirməklə (tatuaj) rəngləmə***

Döymədə iynəylə qan çıxana qədər dəriyə batırılıb, sonra həmin yeri yaşıl və ya mavi rəngə boyamaq üçün üzərinə sürmə və ya göy boya səpilir. Bu, mütləq şəkildə haramdır. Çünki, səhih hədisdə belə rəvayət edilmişdir: **"Allah saçlarına saç əlavə edən və etdirən, döymə edən və etdirən qadınlara lənət etmişdir"**. Ona görə ki, döymə yerinə iynə ilə batırdıqdan sonra, yaşıla rəngləmək üçün oranı sürmə və göy boyayla doldurduqda, sürmə qanla nəcis olur. Qan da donub və yara sağaldıqda, həmin yer yaşıl olaraq qalır. Lakin buna baxmayaraq, üç dəfə yuyulduqda təmizlənir. Çünki ancaq dərinin qopması və ya yaralanmasıyla aradan gedən, təmizlənməsi çətin olan iz və ləkədir.[416]

***Üz dartma və sinəni böyütmə əməliyyatlarının hökmü nədir?***

Üz dartma, burun kiçiltmə, sinə böyütmə və buna bənzər bütün qadın plastik əməliyyatları haram edilmişdir. Çünki **"Allah Rəsulu ﷺ (üz rəngini açmaq üçün) üzün dərisini soyan (pillinq) və soyduran, döymə edən və etdirən, parik taxan və taxdıran qadınlara lənət etmişdir"**[417]

Pilinq, döymə və diş seyrəltmə həm kişilərə və həm də qadınlara haramdır və bu barədə hədislər varid olmuşdur.

Bu gün xına bir çox formada qol, əllər, budlar, sinə və kürək üzərində döyməyə çevrildi. Təbii xınanı döyməyə bənzər şəkildə istifadə etmək halaldır. Bədən üzvünü biruzə vermək və gözəlliyi aşkar etmək məqsədini güdərsə, harama çevrilir.

Sinənin böyüdülməsi əməliyyatlarına gəlincə, bu, yağ və ya sintetik maddələrin inyeksiyasıdır, yaxud sinənin həcmini böyütmək məqsədilə döş toxumalarına balon qoyulmasıdır. Bu əməliyyatın iki şeyə səbəb olduğu qeyd olunur:

1) Xərçəng şişləri nəticəsində döşlərin tibbi əməliyyat yolu ilə çıxarılması və ya sinənin böyük bir şəkildə distrofiyası, qadına mənəvi və cismani çətinlik və sıxıntı təşkil edir.
2) Estetik cəhət və cazibənin artması adətən dəbdəbəli, varlı həyat sürən təbəqədə olur ki, buna bənzər hallar sürətlə çoxalır. Çünki tibb müəssisələrinin dediyi kimi, əməliyyat çox baha başa gəlir.

Bu əməliyyatların şər'i hökmü:

a) Döşləri böyütmə əməliyyatının çox böyük təhlükələri vardır. Xüsusilə, silikon maddəsinin zərərləri tibbdə təsdiq edilmişdir və əksər hallarda xərçəng şişlərinə gətirib çıxarır. Buna görə son dərəcə zəruri hal olmadıqca, əməliyyat etdirmək faydasızdır və ciddi atrofiyaya yol aça bilər.

b) Amma bir tək gözəllik və sinəni açmaq üçün döşlərin ölçüsünü böyütmək qəti şəkildə haramdır. Bunun birinci səbəbi, açılıb saçılmağın haram olması, ikincisi isə, bədənin təhlükəyə məruz qalmasıdır. Doğrusunu Allah bilir.

---

[416] Əvvəldə qeyd olunmuşdur.
[417]"Nil-ul-əutar liş-Şəukəni", 6/190.

## *İstifadə olunmuş kitabların və mənbələrin mündəricatı*


***A- Qurani Kərimin təfsir kitabları***

**1-** "Cəmi-ul bəyən an tə'vil-il Quran", Təbəri təfsiri, Muhamməd bin Cərir Ət-Təbəri, "Dərul-məarif", 1954.

**2-** "Əl-Cəmiu li əhkəm-ıl Quran", Qurtubi təfsiri, Əbu Abdullah Muhamməd bin Əhməd Əl-Ənsari, "Dərul-fikr", 1993.

**3-** "Ən-Nəhr-ul mə'd", Əbu Həyyən əl-Əndəlusi.

**4-** "İbn Kəsir təfsiri", Əbul Fidə İsməil Əl-Qarşi Əd-Diməşqi, "Dərul-Əndəlus", Beyrut, 1986.

**5-** "Qurani-Kərim və məalı", Bakı, 2020.

**6-** "Təfsir-ul Kəbir" adıyla məşhur Ər-Razinin təfsiri, Muhamməd Fəxruddin, Xalil Muhyiddin Əlməysin təhqiqi, "Dərul-fikr", Beyrut, 1993.

**7-** "Təfsir-ul Munir fil-əqidəti vaş-şəriəti val-mənhəc", Vahbət Əz-Zuheyli, "Dərul-Fikr", Diməşq, 1991.

**8-** "Təvilətu əhl-is-sunnə", Əbu Mənsur Əl-Maturidi.

***B- Hədisi-şərif kitabları***

1- "Fəth-ul Bəri alə Sahih Buxari", İbn Hacər Əl-Asqalani Əhməd bin Ali, "Dərul-Fikr", Beyrut.

2- "Kəşf-ul-xafa", Acluni.

3- "Məcmə'-uz-Zəvaid", Heysəmi.

4- "Müstədrak Əl-Hakim", Əbu Abdullah Əl-Hakim Ən-Nisəburi, "Dərul-Məarifə", Beyrut, 1970.

**5-** "Müsənnəf Abdurrazzəq", Abdurrazzəq bin Huməm Əs-Sən'ani, "Dərut-Tə'sil", 2015.

6- "Muvatta Malik", Malik bin Ənəs, Bəşşər Avvad Məaruf, "Mu'sisət-ur-Risələt", Beyrut, 1991.

7- "Nəyl-ul Əutar", Əş-Şəukəni Muhamməd bin Ali, Əhməd Muhamməd Əs-Seyyid Muhyiddin Məstə, "Dərul-Kəlimit-Tayyib", Beyrut, 1999.

8- "Sünənu İbn Macə Əl-Qazvini", İmam Əbul Hasən Əl-Hanəfi Əs-Sindi, Xalil Mə'mun Şeyhanın təhqiqi, "Dərul Məarifə", 1996.

9- "Sünənu Əbu Dəvud", Əhməd Şəkirin təhqiqi, "Dərul Məarifə", Beyrut, 1980.

10- "Sünənu Əl-Beyhəqi", "İbn Ət-Tukməni" kimi məşhur Əbu Bəkr Əhməd bin Ali, "Dərul Məarifə", Beyrut, 1936.

11- "Sünənu Ət-Tirmizi", Əbu İsa Muhamməd bin Surat, Əhməd Şəkirin təhqiqi, "Dərul Hədis", Qahirə, 1990.

12- "Sünənu Əd-Dəraqutni", Əbu Ət-Tayyib Muhamməd Şəmsul Haq Abədi, "Aləmul Kutub", Beyrut, 1983.

13- “Sünənu Ən-Nəsəi-l Kubra”, Əhməd bin Şueyb, İşrəf Əhməd Şəmsuddin, “Dərul-kutubil ilmiyy”, Beyrut, 1992.

14- “Səhih Buxari”, Muhamməd bin İsməil Əl-Buxari.

15- “Şərhu Ən-Nəvəvi alə Sahih Muslim”, Yəhyə bin Zəkəriyyə Əş-Şəfii, “Dərul Qaləm”, Beyrut, 1996.

16- “Ümdət-ul Qari” adlanan “Şərhu Sahih Əl-Buxari lil-Ayni”, Əhməd bin Musə Əl-Hələbi, “Dərul-Fikr”, Beyrut.

***C- İslam Fiqhi***

***Hənəfi fiqhi***

**1-** “Aile ilmihalı”, Hamdi Döndüren.

**2-** “Bədəi-us Sanəi”, Aləuddin Əbi Bəkr Əl-Kəsəni Əl-Hanəfi, Muhamməd Adnən Dərviş, “Dərul-İhyəit-Turasil Arabiyy”, Beyrut, 1997.

**3-** “Dəlilləriylə İslam Hüququ”, Hamdi Döndürən.

**4-** “Əl-Əşbəhu van-nəzair li İbni Nəcim”, Zeynuddin bin Nəcim, “Əl-Hilal”, 1980.

**5-** “Əl-Lubəb” Abdul Ğani Əl-Ğanimi Əd-Diməşqi Əl-Hanəfi, “Dərul-Kutubil-İlmiyy”, 1993.

**6-** “Əl-Hidəyə Şərhu Bidəyət-il Mubtədi”, Ali bin Abdul Cəlil Əl-Mərğinəni, “Əl-Məktəbətul -sləmiyy”.

**7-** “Əl-Məbsut şərhu Kitəb-il Əsl li Əbi Abdullah Muhamməd bin Əl-Hasən Əş-Şeybəni Şəmsəddin Əs-Səraxsi”, Əbul Vafə Əl-Əfğani, “Aləmul Kutub”, Beyrut, 1990.

**8-** “Fətəva-l Hindiyyə”, Şeyx Nizam Fəxruddin Əl-Fərğani, “Dərul-İhyəi ət-Turasil arabiyy”, Beyrut, 1980.

**9-** “Günümüzün meselelerine fetvalar”, Halil Gönenç.

**10-** “Ğünyət-ul Mutəməlli fi şərhi məniyyət-il musalli”, Şeyx İbrahim bin Muhamməd Əl-Haləbi, “Dəru Səadət”, h.1325.

**11-** “Ğurər və Durər” (tərc. Arif Erkan), Molla Hüsrev, 1980.

**12-** “Hanımlara fetvalar”, Dr. Faruk Beşer, İst. 1990.

**13-** “Haşiyətu Ət-Tahtavi alə Məraq-il Fələh”, Muhamməd bin İsməil Ət-Tahtavi, “Əl-Məktəbətul-Əmiriyyə Əl-Kubra”, Qahirə, 1900.

**14-** “Kadın ilmihalı”, H. Cemal Öğüt.

**15-** “Kadın ilmihalı”, Asim Uysal-Mürşide Uysal.

**16-** “Kaynaklarıyla İslam Fıkhı”, Celal Yıldırım.

**17-** “Kaynaklarla ahkam hadisleri”, Celal Yıldırım.

**18-** “Məvqufat” (tərc, A. Davudoğlu), M. Məvqufati.

**19-** “Multəqa” tərcüməsi, Mustafa Uysal.

**20-** “Radd-ul Muhtər alə Dər-il Muxtər bi haşiyəti İbn Abidin”, Muhamməd Əmin Abidin Əd-Diməşqi, Muhamməd Subhi Halləqın təhqiqi, “Dərul-İhyəit-Turasil Arabiyy”, Beyrut.

**21-** “Şərhu Fəth-il Qadir”, Muhamməd bin AbdulVahid, “Dərul-İhyəit-Turasil Arabiyy”, Beyrut, 1912.

**22-** “Təbyin-ul haqaiq”, Fəxruddin Usmən Əz-Zeyləi Əl-Hanəfi, “Dərul-Məarifə”, Beyrut, 1996.

***D- Şafii fiqhi***

**1-** “Əl-Məcmu’”, Nəvəvi.

**2-** “Əl-Məcmu şərh-il-məhzəb”.

**3-** “Əl-Umm”, Şafii.

**4-** “Haşiyətu Əd-Dəsuqi”.

**5-** “Həvaşi əş-Şirvani və İbnul-Qasim alə Tuhfət-il-Muhtəc”, əş-Şirvani.

**6-** “Nihəyətul muhtəc”.

**7-** “Muğnil-muhtəc”.

**8-** “Raudat-ut Talibin”.

***E- Qazet və jurnallar***

**1-** İbrahim Yıldız «Quran və Sünnəyə görə sosial həyatda qadın kişi münasibəti”, Harran Universiteti İlahiyyat fakültəsi jurnalı, 42-ci nömrə, iyul-dekabr, 2019.

***Mənbələr***

**1-** “Böyük İslam İlmihali”, Ömər Nasuh Bilmən, İstanbul, 2003.

**2-** DİB, “İlmihal”

**3-** “Dörd məzhəbə görə İslam Fiqhi”, 1, Abdurrəhman Cəziri, “Çağrı yayınları” , 7-ci nəşr, İstanbul, 1993.

**4-** “Əhkəm-ul-usrat va-l-beyt-ul-muslim”, Muhamməd Mutəvəlli Əş-Şəaravi, “Məktəbətu Ət-Turasul İsləmiyy”, Qahirə, 1998.

**5-** “Əhval-uş-şəxsiyyəti”, Muhamməd Əbu Zuhrat, “Mətbəatu Muxaymər”, Qahirə, 1958.

**6-** “Əxbar Əbu Hənifə və əshabih”, Əs-Sayməri.

**7-** “Əl-İsabə”, İbn Həcər.

**8-** “Əl-Məarif”, İbn Quteybə.

**9-** “Əl-Məususət-ul-fiqhiyyə”, 1-ci nəşr,1982.

10- “Əl-Fiqh-ul-isləmiyy va ədillətuhu”, Vahbət Əz-Zuhayli, “Dərul Fikr”, Suriya.

11- “Ət-Tabaqatul-kubra”, İbn Sad.

12- “Ət-Təşri-ul cinayil-isləm”.

